*Bu Kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş Üzrə Dövlət Komitəsinin razılığı ilə çap olunmuşdur.*


| | |
|---|---|
| Kitabın orjinal adı: | Haccı Mebrur ve Umre |
| Müəllif: | Osman Nuri Topbaş |
| Tərcüməçi: | fil. e. n. Siracəddin Hacı |
| Dini redaktor: | Prof. dr. A. Kahraman |
| Ədəbi redaktor: | Vəfa İbrahim |
| Nəşrə hazırlayan: | Salih Zeki Meriç |
| Dizayn: | Elşən Rzayev |

ISBN: 978-9952-8111-6-2
İpək Yolu Nəşriyyatı: 13
Bakı 2007






İPƏK YOLU NƏŞRİYYATI



Bakı Şəhər Səbail Rayonu
Badamdar Qəsəbəsi, I yaşayış massivi, ev 415
Tel: (+994 12) 492 32 23
Faks: (+994 12) 492 21 67

Elektron poçt: ipekyolu_llc@yahoo.com

İÇİNDƏKİLƏR:







# TƏQDİMAT

İslamın beş əsas şərtindən biri olan həcc, həm maddi, həm də (mənəvi) bədənlə edilən bir ibadətdir. Saymaqla bitməyən fəzilətlərlə dolu olan bu ibadəti bəlkə də bir çoxumuz ömründə bir dəfə yerinə yetirməyə qadir olacağıq. Əgər onu layiqincə yerinə yetirə bilməsək həm mənəvi, həm də ruhi baxımdan istifadə etməmiş olarıq. Həcci ehkamına uyğun şəkildə yerinə yetirə bilmək isə,digər ibadətlərdə olduğu kimi yüksək səviyyədə mənəvi hazırlıq, kamil bir iman və irfandan aslıdır.

Heç şübhəsiz, İlahi nəzərlərin insandaki təcəlligahı qəlb olduğu kimi, kainatdakı təcəlli yeri də Kəbədir. Demək olar ki, kainat içində Kəbə bir baxımdan qəlbimiz mahiyyətindədir. Məhz buna görə də, həcc Kəbənin ehtişamını idrak edərək qəlb həyəcanı ilə yerinə yetirilməsi zəruri olan bir ibadətdir.

Zəvvarlarımızın Həccin vacibatı, sünnətləri və müstəhəbləri ilə yanaşı **Məkkeyi-Mükərrəmə** və **Mədineyi-Münəvvərə**-də baş vermiş həcclə bağlı hadisələri öyrənərək Harameyni şərifeynə getmələri, həcc ibadətini təqva ilə yerinə yetirə bilmələri üçün çox lüzumludur.





İlk növbədə ehrama girərkən dünyanı geridə buraxa bilmək üçün yalnız zahiri libaslardan deyil, daxili aləmimizdəki var-dövlət, şan-şöhrət və vəzifə ehtiraslarından da sıyrılaraq, ayədəki ifadə ilə təqva libasına bürünmək lazımdır.

Arifanə bir könüllə həcc ziyarətini əda edə bilmək üçün bu məkanlarda bir çox Peyğəmbərin ayaq izlərini axtarmaq lazımdır. Bel əcə həmin dövrləri yenidən idrak etmiş kimi olarıq.

Beytullah, İbrahim *-əleyhissəlam-* və ailəsinin təvəkkül və təslimiyyət xatirələri ilə dolu olan bir məkandır. Təvəkkül, təslimiyyət və həcc deyiləndə İbrahim *-əleyhissəlam-* və İsmayıl *-əleyhissəlam-* ilə anası həzrət Həcər anamız yadımıza düşməlidir.

Səfa ilə Mərvə arasında səy edərkən həzrət Həcərin qorxu və həyəcan içində su tapmaq məqsədilə gedib-gəlməsini acizanə bir halda yenidən yaşamalıyıq. Həmçinin iki yaşıl dirək arasına gələn-də sürətimizi artırarkən Hz. Peyğəmbərin müşriklərə qarşı xoşədalı görünmək üçün etdiyi hərəkətləri xatırlamaq lazımdır.

Xulasə əlinizdəki bu kiçik kitabça ehrama girəndən, Ərafatda və Müzdəlifədəki vəqfəyə; Minada şeytan daşlamaqdan, qurban kəsməyə ; Həcərül əsvəddən məqami İbrahimə qədər bir çox həccin rüknləri və məkanları ilə bağlı hikmət

və mənəviyyat pəncərəsindən baxmağınıza səbəb olacadır.

*Sizləri müəlliflə baş-başa buraxarkən məşəqqətdən uzaq, günahsız və məqbul olunmuş tam bir həccə nail olmağınızı arzu edirik. Amin!*

*Qafqaz Müsəlmanları*
*İdarəsi Sədrinin birinci müavini*
**Müfti Hacı Salman MUSAYEV**
07.11.2007
BAKI

# ÖN SÖZ

Bizləri iman lütfünə nail edərək onun meyvəsi olan ibadətlərlə özünə qovuşmaq yollarını açan uca Allaha həmd və sənalar olsun!

Allaha qovuşmaq yolunda ən gözəl qulluq üçün bütün insanlığa misilsiz bir örnək və rəhbər olan Varlıq Nurumuz, Şəfaətçimiz Peyğəmbərimizə *-səllallahu əleyhi və səlləm-* sonsuz səlat və salam olsun!

İnsan oğlunun maddi və mənəvi olmaqla saysız-hesabsız ehtiyacları var. Bunların bəziləri insan həyatı üçün çox zəruridir. Məsələn, bədənin yaşaya bilməsi üçün hava, su və qidanın olması şərtdir. Bununla birgə, ruhun da çox zəruri olan bir sıra ehtiyacları var. Hətta, bunlar bədənin ehtiyaclarından daha önəmlidir. Çünki bədən torpaq yolçusu, ruh isə sonsuzluq yolçusudur.

Bu baxımdan uca Allah:

**«Göydə də ruziniz (yağış, qar) və vəd olunduğunuz şey (mükafat, cəza) vardır! (Sizə vəd olunan mükafat, ya da cəza Allahın dərgahındakı Lövhi-Məhfuzda yazılmışdır)»** (əz-Zariyat, 22) buyuraraq insanın mənəvi qidaya olan ehtiyacına işarə etmiş və könüllərin qidasının ibadət olduğunu ehsan buyurmuşdur. Buna görə də, bütün ibadətlər uca Allah tərəfindən əmr edilsə də, əslində, insan üçün ən zəruri olan mənəvi ehtiyacıdır. Belə ki ruh və könül, ibadətlərdən əldə edəcəyi qidanı başqa heç bir şeydən ala bilməz. Bu gün bu həqiqəti anlamayan insanlar ruhlarının əzab içində olmasını seyr etməkdən başqa, bir şey edə bilmirlər. Ancaq könül qidasını əldə edən bəxtiyarlar isə tamamilə başqa bir ahəng, dinclik iqlimi içərisində, iztirab və cəfaları belə nemətə çevirərək həyatlarını eşq və istiqamət üzrə davam etdirirlər. Çünki daddıqları mənəvi həzz, ilahi feyz onların dünyanın girdablarının içinə düşməsinin qarşısını alır.

Bir sözlə, həm insanın zəruri olan könül ehtiyacını ödəmək, həm də sonsuz nemətlərə qarşı nankorluq etməyib, şükür edən bir qul olmağı təmin etmək üçün bir sıra ibadətlər xüsusi olaraq fərz edilmişdir. Məsələn, bir həkim öz xəstəsinə onun mütləq istifadə etməsi zəruri olan dərmanların reseptini yazması və bu dərmanların

qəbul edilməsinin xəstənin sağalması üçün zəruri olduğunu şərt qoyması kimi.

Çünki insanlar çox zaman ya tənbəlliklərindən, ya da məsələnin mahiyyətini bilmədiklərindən ibadət ehtiyaclarına qarşı biganə olurlar. Ona görə də, uca Allah qullarına ruhlarının ən zəruri ehtiyacı olan ibadətləri fərz edərək onları sonsuz məhrumiyyətdən xilas etmək istəmişdir.

Bu zəruri ibadətlərin ən önəmlisi, şübhəsiz, namazdır. Bu baxımdan, ibadətlər içində öncə **namaz** fərz edilmişdir. Çünki namaz şərtlərinə uyğun qılınarsa, qəlbdəki pərdələr qalxar. **«Namaz möminin meracıdır»** həqiqətinin təcəlliləri ilə Haqqın hüzurunda inanılmaz bir vüsal yaşanar. Bu vüsal uca Allahın **«Səcdə et və yaxınlaş!»,** əmrinə əməl etməkdən sonra təcəlli edər.

Namazdan sonra ruhlarımızı bəsləyən başqa bir fərz ibadət də «**oruc**»dur. Oruc, səbir, iradə və nəfsani arzulara müqavimət kimi halların yardımı ilə əxlaqi kamilləşməyə yol açan böyük bir ibadətdir. O, insana Allahın lütf etdiyi nemətlərin dəyərini xatırladır. Toplumdakı acların, yoxsulların, ayrı-ayrı sıxıntılar içində qıvrılanların halını düşünməyə şərait yaradır və varlı olan şəxslərə də ac, yoxsul insanların məhrumiyyətini daddıraraq onları bu məsələdə bərabərləşdirir. Beləliklə, varlı insanların yardım və mərhəmət hisslərinin inkişafına yol açır.

İslam ictimai münasibətlərdə yoxsul ilə varlı arasında sevgi yaradıb, həsəd və düşmənçiliyi yox etmək üçün **zəkat** və **infaqı** da bir fərz ibadət olaraq əmr etmişdir. Bu fərz ibadətdə varlı insanlarda sərvətə ram olmaq nəticəsində meydana gələ biləcək azğınlıqlara qarşı sədd çəkmək, möhtacların qəlbində isə varlılara qarşı mənfi təmayüllərin baş qaldırmasının qarşısını almaq, bu yolla da ictimai həyatdakı tarazlığı qorumaq kimi bir sıra hikmətlər var.

Bu ibadətlərdən başqa, həm maddi, həm də bədəni olan bir fərz ibadət də var ki, o da «**həcc**»dir. Həcc, könüllərdəki imanı kamilləşdirən və məhşərin bir bənzərini bu dünyada canlandıraraq **«Ölmədən əvvəl ölün!»** sirrini anlamağa yol açan önəmli bir ibadətdir.

Həccin mənəvi yönü zahiri tərəfindən daha önəmlidir. Həzrət Peyğəmbərin -*səllallahu əleyhi və səlləm*- **«həcci-məbrur»** (qəbul olunan, xeyirli həcc) ifadəsi ilə bildirdiyi həcc də başdan-başa mənəvi gözəlliklərdən ibarət və ruhaniyyətlə dolu olan bir ibadətdir. Bu yönü ilə həcc, dua etmək, tövbə və bağışlanma istəməklə könüllərin ilahi rəhmət, bərəkət və fəzilətlərə nail olması, həyatın saleh əməllərlə sağlamlaşdırılmasıdır. **Həcc ziyarətindən sonra da bu gözəl halın davam etməsi üçün uca Allaha söz verilməsidir.**

Allah Rəsulu *-səllallahu əleyhi və səlləm-* həcc və ümrə vasitəsi ilə saleh əməllər nəticəsində əldə edilən qazancı açıqlayarkən bu mübarək ibadətlərdəki məqsədi də nəzərdə tutaraq belə buyurmuşdur:

**«Həcclə ümrənin arasını birləşdirin. Çünki bunlar günahı körüyün (atəşin) dəmirdəki pası təmizlədiyi kimi təmizləyər».** *(Nəsai, «Mənasiq», 6; İbni-Macə, «Mənasiq», 3)*

Beləliklə, belə bir mənəvi təmizlənməyə, yeniləşməyə və imanın təzələnməsinə yol açan, mübarək hədisdə **«Həcc ilə arasının birləşdirilməsi»** tövsiyə edilən ümrə ibadəti də çox önəmlidir.

İldə bir dəfə olan və bəlli günlərdə icra edilən həccdən başqa, ilin hər hansı bir vaxtında və istənilən qədər edilməsi mümkün olan **ümrə**, çox fəziləti olduğuna görə, **«kiçik həcc»** adlandırılır. Bu ibadətin fəzilətini də dərindən anlamağımız zəruridir.

Bütün bu ibadətlərin mahiyyətində olan bir məsələni ayrıca olaraq vurğulamaq istəyirik. Bu ibadətlər ancaq **səmimi bir qəlb** və **ixlasla** yerinə yetirilməlidir. Əgər qulluğumuzun Allah yanında qəbul olunmasını arzu ediriksə, səylərimiz ibadətlərimizi eşq və ədəb çərçivəsində yerinə yetirməyə yönəlməlidir. Ancaq bu halda

ibadətlərimiz saleh əməl keyfiyyətini qazanar və əbədi aləmdəki səadət azuqəmiz olar.

Biz də bu təvazökar əsərimizdə həcc və ümrə ibadətinin mənəvi yönünü və təqva ölçüləri içində yerinə yetirilməsi üçün zəruri olan ədəbi acizanə surətdə ifadə etməyə çalışdıq. Bu məsələ ilə bağlı daha öncədən istər əsərlərimizdə, istərsə də məqalələrimizdə ifadə etdiyimiz fikirləri yenidən təsnif edərək, həcc və ümrənin mənəvi cəhəti ilə bağlı qısa, yığcam və bu ibadətlərin mahiyyətini əks etdirən məlumat axtaran din qardaşlarımıza təqdim etdik.

*Uca Allah bütün ibadətlərimizi hər zaman ixlas və təqva ölçüləri çərçivəsində yerinə yetirməyi bizlərə nəsib etsin! Axirət yolçu-luğumuzda namazımızı əbədi yoldaşımız, oru-cumuzu əbədi sirdaşımız, zəkat və infaqlarımızı əbədiyyət qidamız, həccimizi də ən məqbul könül yoldaşımız etsin! İbadətlərimizin hər birini ilahi hüzura layiq bir ölçüdə icra edə bilməyi hamımıza qismət etsin!*

*Amin!*

Osman Nuri Topbaş

İslamın beş təməl əsasından biri olan **həcc**, həm maddi, həm də bədənlə olan bir ibadətdir. Çoxsaylı fəzilətlərlə dolu olan bu ibadəti layiqincə yerinə yetirə bilmək isə yüksək bir mənəvi hazırlığa, kamil bir imana və irfan üfüqünə bağlıdır.

Həcc, nəbilər silsiləsinin ilki olan Adəmdən *-əleyhissəlam-* son Peyğəmbərədək davam edən və bu dünyada məhşərin bir bənzərini canlandıraraq **«Ölmədən əvvəl ölün!»** sirrinin həqiqətlərini anlamağa yol açan ülvi bir ibadətdir.

Həzrət Adəm və Həvva *-əleyhiməssəlam-* ilə başlayan insanlıq ailəsi dini əmin-amanlıq və səadət iqlimində yaşamaq üçün bugünkü Məkkeyi-Mükərrəmədəki Kəbənin yerini ilk ibadətxanə etmişdilər. Adəm oğulları dəyişən həyati və ictimai şərtlərə görə müxtəlif yerlərə yayılmış, aradan əsrlər keçmiş, nəsillər dəyişmiş, insanlar haqq dinindən





uzaqlaşmış və bir müddət sonra bu müqəddəs məbəd yer üzündən silinmişdir. Həzrət İbrahim **-əleyhissəlam-** uca Allahın əmri ilə bu məbədi yenidən tikmiş və onun duası ilə Allah bu məkanı bərəkətləndirmişdir. Uca Allah bunu Qurani-Kərimdə belə bəyan edir:

**«(Ey Rəsulum!) Xatırla ki, bir zaman İbrahim belə demişdi: «Ey Rəbbim! Bu diyarı (Məkkəni) əmin-amanlıq yurdu et. Məni və oğullarımı bütlərə tapınmaqdan uzaq elə! Ey Rəbbim! Onlar (bütlər), həqiqətən, çox insanı (haqq yoldan) azdırıblar. İndi kim arxamca gəlsə, o, şübhəsiz, məndəndir. Kim mənə qarşı çıxsa, (bilsin ki, tövbə edəcəyi təqdirdə) Sən (günahları) bağışlayansan, (bəndələrinə) rəhm edənsən!**

**Ey Rəbbimiz! Mən əhli-əyalımdan bəzisini (İsmayılı və anası Həcəri) Sənin Beytül-Həramının (Kəbənin) yaxınlığında, əkin bitməz bir vadidə (dərədə) sakin etdim. Ey Rəbbimiz! Onlar (vaxtlı-vaxtında, lazımınca) namaz qılsınlar deyə belə etdim. Elə et ki, insanların bir qisminin qəlbləri onlara (Kəbənin ziyarətinə, əhli-əyalıma mərhəmət göstərməyə) meyl etsin. Onlara (bu yerin ağaclarının) meyvələrindən ruzi ver ki, (nemətinə) şükür edə bilsinlər!».** *(İbrahim, 35-37)*

Həcc ibadəti islamiyyətdən öncə də var idi. Ancaq müşriklər onu ibadət olmaqdan çıxarmış, bir





növ güclü, qüvvətli şəxslərə qarşı göstərilən qeyri-əxlaqi bir rəsmi mərasimə çevirmişdilər. Belə ki ərəblər arasında imtiyazlı bir qəbilə olan qureyşlilər Kəbəni paltarla təvaf edər, ancaq başqa ərəblər, qadın-kişi - hamısı çılpaq bir şəkildə Allahın evini təvaf edərdilər. Paltarlarını çıxaran çılpaq insanların məhrəm yerlərini örtməsi Qureyşin səxavətinə bağlı idi. Yəni qureyşlilər onlara paltar versə, örtünərək, verməsə, çılpaq bir vəziyyətdə Kəbəni təvaf edərdilər. Qurban kəsəndə də onun qanını Kəbənin qapı və divarlarına sürtər, qurbanın ətini də yandırardılar.

Nəhayət, dünya gününün işığına bənzəyən səadət əsri gəlmiş və mübarək Peyğəmbərimiz həzrət Məhəmməd Mustafa *-səllallahu əleyhi və səlləm-* ilə dini həyat ilk dəfə başladığı yerdə son kamal zirvəsinə çataraq, bu həyasız adətləri və xurafatları tamamilə ortadan qaldırmışdır. Çünki İslamda hər bir ibadətin başlıca məqsədi Allahı zikr etmək və Ondan bağışlanma istəməkdir.

Peyğəmbərimiz *-səllallahu əleyhi və səlləm-* Məkkə və Mədinə mərkəzli bir səadət əsri yaşamış, yaşatmış və beləliklə, o məkanlar qiyamətədək İslamın və müsəlmanların nəbzinin vurduğu mübarək bir yerə çevrilmişdir.



Həccin yerinə yetirildiyi mübarək torpaqlar həzrət Adəmdən başlayaraq imanlı ürəklərin ruhaniyyəti ilə bərəkətlənmiş, aşiqanə göz yaşları ilə islanmışdır. Arifanə bir könüllə həcc ziyarəti edənlər o məkanlarda bunları və bir çox Peyğəmbərin mənəvi izlərini axtarar, onların xatirələrindən feyz alarlar. Çünki müstəsna bir feyz qaynağı olan bu müqəddəs məkanlar nəbilər silsiləsinin unudulmaz xatirələri ilə doludur. Bu yerlərdə hər zaman Allahın rəhməti, bağışlaması və bərəkəti xatırlanır.

Bu baxımdan, həccin bir məqsədi də Rəbbimizin o mübarək məkanlardakı nişanələrinə təzim və hörmət göstərmək, oradakı toxunulmaz məqamların xatirəsi ilə könülləri bərəkətləndirməkdir.

Həcc və ümrə niyyəti ilə o mübarək torpağa ayaq basanlar İbrahimin *-əleyhissəlam-*:

**«Ey Rəbb! Günahlarımızı bağışla, əfv et! Sən ən böyük Rəhman və Rəhimsən! Ey Rəbb! Mənim övladımı da mənim yoluma, mənim dinimə yolçu et!»**, dualarına qoşularaq bu dualardakı feyz və bərəkətə nail olurlar.

Bu və buna bənzər saysız-hesabsız nemətlər mömin könülləri o mübarək məkanların həsrət və ehtiyacı ilə yandırmışdır. Çox eşq karvanı gah:

*Görməz oldum iraq ilə yaxını,*
*Gözəl Kəbətüllah varayım sana!*

tərənnümləri ilə inləmiş, gah da:

*Ey badi-səba, düşsə yolun səmti-Hərameynə,*
*Salamımı ərz eylə Rəsulus-Səkaleyinə!..*

**«Ey sabah küləyi! Əgər yolun Məkkə və Mədinəyə düşsə, oralara və xüsusilə, insanların və cinlərin Peyğəmbəri həzrət Məhəmməd Mustafaya salamlarımı çatdır!»**, ifadələri ilə o mübarək yerlərə və həzrət Məhəmmədə sevgi dolu salamlar göndərmişlər.

Bu məhəbbət təzahürləri könüllərdə elə dərinləşmişdir ki, müqəddəs torpaqlara gedənlərin dua və salamlarla yola salınmaları bir növ ənənəyə çevrilmişdir. Həccə gedənlərin qulaqlarına pıçıltı ilə söylənilən sevgi və məhəbbət dolu könül istəklərini şair belə dilə gətirir:

*Keçdiyiniz yollara,*
*Bizdən salam aparın!*
*Haqq dost deyən qullara,*
*Bizdən salam aparın!..*

*Varın həcci ifaya,*
*Çatın sonsuz səfaya,*
*Məhəmməd Mustafaya,*
*Bizdən salam aparın!..*

*Məkkə ilə Mədinə,*
*İki gözəl xəzinə,*

*Çəhar yari-güzinə,*
*Bizdən salam aparın!..*

*Ləbbeyk deyib boyuna,*
*Qaçın Zəmzəm suyuna,*
*Bəni Haşim soyuna,*
*Bizdən salam aparın!..*

*Girərsiniz ehrama,*
*Əl sürtmədən Hərama,*
*Səhabeyi-kirama,*
*Bizdən salam aparın!..*

*Yalvarıb Rəbbimizə,*
*Dualar edin bizə,*
*Müəzzəm Kəbəmizə,*
*Bizdən salam aparın!..*

*Girənlər eşq bağına,*
*Düşməz qəflət toruna,*
*O gözəl Nur dağına,*
*Bizdən salam aparın!..*

*Girib qəlbi-Hatimə,*
*Səcdə edin Rahimə,*
*Məqami İbrahimə,*
*Bizdən salam aparın!..*

*Haqdan gələn bərata,*
*Açılan hər qanada,*





*Minaya, Ərəfata,*
*Bizdən salam aparın!..*

*Cənnətül-Baqimizə,*
*Gülşəni-pakimizə,*
*O fərahnakimizə,*
*Bizdən salam aparın!..*

Hər zaman bu sevgi və məhəbbətin tüğyanı içində yaşayıb, könüllərini təskin edə bilməyən bir çox Haqq dostu bir anda uzun məsafələri qət edərək o rəhmət yurduna uçmuş və namazlarını orada qılmışdır. Hətta, onlardan bir çoxu o yerlərin sevgisi ilə o qədər yanmışlar ki, bu müqəddəs məkanlara gedə bilmək imkanı olmayan çoxlu yoxsul aşiqlərə də bu lütfdən pay verə bilmişlər. Belə ki həzrət Əziz Mahmud Hüdayinin mənəviyyat səmalarında qanad açmasına səbəb olan bu hadisə məşhurdur:

Bursanın qazısı olduğu illərdə həzrət Hüdayi maraqlı bir məhkəmə işi ilə qarşılaşır. Bir qadın ərindən şikayət edərək bunları söyləyir:

*«Möhtərəm qazı! Ərim hər il həccə getməyə niyyət edir. Ancaq yoxsul olduğuna görə imkan tapıb həccə gedə bilmir. Bu il də həccə getməklə bağlı niyyət etdi. Hətta: «Əgər bu il həccə gedə bilməsəm, səni boşayacağam!»,-dedi. Sonra Qurban bayramı ərəfəsində qeyb oldu. Beş-altı gün sonra ortaya çıxıb, həccə gedib-gəldiyini söylədi. Heç belə bir şey ola*

*bilərmi? Möhtərəm qazı! Artıq bu yalançı şəxsdən boşanmaq istəyirəm!..»*

Qazı Mahmud bu şikayətin araşdırılması üçün qadının ərini çağırtdırır və onun xanımının söylədiklərinin doğru olub-olmadığını soruşur. O şəxs qazıya deyir:

*«-Hörmətli qazı! Xanımımın dedikləri də doğrudur, mənim söylədiklərim də. İstəyirəm biləsiniz ki, mən həqiqətən həccə gedib gəlmişəm. Hətta, o mübarək yerlərdə bursalı bir sıra hacılarla da görüşdüm və onlara buraya gətirmələri üçün bir neçə hədiyyə əmanət verdim,*-deyir.

Qazı Mahmud çaşqınlıq içində:

- *Bu necə ola bilər?!,*-deyə soruşur.

O şəxs dediklərini izah edir:

*- Hörmətli qazı, hər il olduğu kimi, bu il də həccə gedə bilməyəndə böyük bir kədərlə Eskici Mehmed Dədənin yanına getdim. O da mənim əlimi tutdu, gözlərimi yummağımı istədi. Gözümü açanda gördüm ki, Kəbədəyəm!..»*

Belə bir mənəvi hadisəyə ilk dəfə şahid olan qazı bunun mümkün olmadığını söyləyərək o şəxsin dediklərini qəbul etmir. Bundan sonra müqəddəs torpaqlardakı ruhaniyyətin və mənəvi iqlimin onda

yaratdığı duyğularla yaşayan o şəxs sadəlövh, ancaq çox düşündürücü bir cavab verir:

*«Hörmətli qazı! Uca Allahın düşməni olan şeytan bir anda bütün dünyanı gəzə bildiyi halda, Allahın dostu olan səmimi bir qul niyə bir anda Kəbəyə gedə bilməz?!»*

Qazı Mahmud onun dediklərini çox mənalı bir cavab sayaraq məsələ ilə bağlı qərar verməyi bursalı hacıların geri qayıtmasınadək təxirə salır. Bursalı hacılar geri qayıdanda apardığı araşdırma ilə məsələni olduğu kimi öyrənir, böyük bir heyrət və çaşqınlıq içərisində məhkəmə işini ləğv etmək məcburiyyətində qalır. Ancaq onun ürəyinə sirli bir qor düşür. O, bundan sonra Eskici Dədə vasitəsi ilə həzrət Üftadənin mənəvi çevrəsinə (yoluna) daxil olaraq dünyaya qütb olan bir könül sultanına çevrilir.



Başqa yöndən, o mübarək torpaqlara duyulan həsrət və şövq sadəcə qumlu çölləri seyr etmək üçün deyil. O yerlərə yönəliş İbrahimin *-əleyhissəlam-* məqamını, İsmayıl *-əleyhissəlam-* və övladının vətənini ziyarət etmək üçündür. Rəsulullahın *-səllallahu əleyhi və səlləm-* doğulub-böyüdüyü, İslamı təbliğ etdiyi torpaqlara getmək o uca Varlıq Nurunun nəfəs aldığı havanı ciyərlərimizə və

könüllərimizə çəkmək istəyidir. Haqq dostu bir şair çox gözəl söyləyir:

*«Başdan aşağıyadək hara göz gəzdirsəm, saysız-hesabsız möcüzə qəlbin ətəyindən yapışıb: «Əsl məkan buradır!»,-deyir».*

Bu ifadələr sadəcə şairanə bir hissiyat deyil, eyni zamanda ilahi bir həqiqətdir. Uca Allah buyurur:

فِيهِ آيَاتٌ بَيِّـنَاتٌ

**«Orada aydın nişanələr var...».** *(Ali-İmran, 97)*

Başqa sözlə, o müqəddəs məkanlarda gözlərindəki qəflət pərdələrini aralayaraq könül gözləri ilə ətrafa baxanların iman dəryaları coşar, eşq və ilahi məhəbbət bütün varlıqlarını çulğalayar. Hara baxsalar, uca bir vəcd və dünyanı unutduracaq duyğular onu ağuşuna alar. Beləliklə, onların gözləri yaşarar, dilləri hər zaman uca Allahın adını zikr edər. Onlar o mübarək yerlərdəki bütün vaxtlarını yüksək bir ədəb və hörmətlə keçirərlər. Bu da mübarək ayədə buyurulan ilahi sirdən alınan uca bir qismətdir:

ذَلِكَ وَمَنْ يُعَظِّمْ شَعَائِرَ اللهِ فَإِنَّهَا مِنْ تَقْوَى الْقُلُوبِ

**«(Ey insanlar! Sizə əmr etdiyim) budur. Və hər kəs Allahın mərasiminə (həcc əməllərinə,**





**ya da qurbanlıq heyvanlara) hörmət etsə, bu (hörmət), şübhəsiz, qəlblərin təqvasındandır (Allahdan qorxmasındandır)».** *(əl-Həcc, 32)*

Bu baxımdan həcc sırf maddi və zahiri bir ibadət deyil. Onun mənəvi yönü zahiri yönündən daha önəmlidir. Həzrət Peyğəmbərin *-səllallahu əleyhi və səlləm-* **«həcci-məbrur»** (qəbul olunan, xeyirli həcc) ifadəsi ilə bildirdiyi həcc də başdan-başa mənəvi gözəlliklərdən ibarət olan bir həcdir. Bu yönü ilə həcc, dua etmək, tövbə və bağışlanma istəməklə könüllərin ilahi rəhmət, bərəkət və fəzilətlərə nail olması, həyatın saleh əməllərlə sağlamlaşdırılmasıdır. Həcc ziyarətindən sonra da bu gözəl halın davam etməsi üçün uca Allaha söz verilməsidir.

Həzrət İbrahimin *-əleyhissəlam-* bu duası çox gözəldir:

*«(İbrahim və İsmayıl deyirlər:)* **«Ey Rəb-bimiz! Bizim hər ikimizi Sənə itaətkar** *(mü-səlman),* **nəslimizdən yetişənləri Sənə təslim olan ümmət** *(müsəlman)* **et, bizə** *(həcc)* **əməllərimizi** *(ibadət qaydalarımızı)* **göstər, tövbəmizi qəbul et! Həqiqətən, Sən tövbələrimizi qəbul edənsən, mərhəmətlisən!».** *(əl-Bəqərə, 128)*

Deməli, həcc ziyarətini yerinə yetirən aşiq könüllər bir yandan bu dua ilə yoğrulurlar, başqa

yöndən də Hərami-Şərif daxilində və bütün Məkkə küçələrində Peyğəmbərin *-səllallahu əleyhi və səlləm-* gəzdiyini, yaşadığını düşünərək Onun mübarək ayaqlarının izinə toxuna biləcəklərini xəyal edərlər, o izlərə sevərək üz sürtə bilməyin həyəcanını yaşayarlar və onlarla bağlı çoxlu xatirələri yadlarına salarlar. Məsələn, Səfa təpəsində həzrət Peyğəmbərin *-səllallahu əleyhi və səlləm-* Məkkə müşriklərinə xitab etdiyini düşünüb, o günləri gözləri önündə canlandırarlar. Düşünərlər ki, o mübarək Peyğəmbər bu təpədən məkkəlilərə Əbu Kubeys dağını göstərib belə müraciət etmişdir:

*«-Sizə: «Bu dağın arxasında düşmən var. Və bu düşmən buraya yaxınlaşmaqdadır. O sizin canınıza qəsd edəcək, buna qarşı tədbir görün!»,-desəm, buna inanarsınızmı?».*

Məkkəlilər də:

- İnanarıq. O dağın arxasını görməsək də, sən **«Məhəmmədül-Əmin»** olduğuna görə verdiyin xə-bərin doğruluğuna əsla şübhə etmərik!»,-demiş-dilər.

Bundan sonra o Varlıq Nuru olan Peyğəm-bərimiz:

*«-Mənə inandığınız kimi, buna da inanın ki, bu aləmi yaradan, tək və qadir olan bir Allah var! Sitayiş etdiyiniz bütlər aciz bir daş, torpaq, ya da odun*

*parçalarıdır. Bunlardan imtina edib, bir olan Allaha iman gətirin. Bilin ki, Allah məni sizə Peyğəmbər olaraq göndərdi»,*-dedi.

Ancaq başda əmisi Əbu Ləhəb olmaqla o bədbəxt müşriklər:

- Sən bizi buraya bunun üçün çağırdınmı?,- deyərək Ondan üz çevirmiş və dağılmışdılar. Onlar ürəklərində Peyğəmbərin dediklərinin doğru olduğunu qəbul etdikləri halda, nəfslərinin istəkləri Onu inkar etmişdi.

Ancaq o mübarək Peyğəmbər bu və bunun kimi çoxsaylı qəflət, dəlalət təzahürlərinə baxmayaraq, bezməmiş, nəbəvi bir iradə ilə ilahi həqiqətləri susuz könüllərə bir abi-həyat kimi təqdim etmişdir.

Həcc ziyarətində belə ibrətli həqiqətləri düşünərək, doğru olanları qəbul edən könül nəzəri ilə ətrafa baxsaq, Peyğəmbərimizin -əleyhissəlatü vəssəlam- tərbiyəsinə məkan olan Darül-Ərkamın önündə dayanaraq bu evin içərisindəki səmimiyyətlə dolu Quran təlimlərinin təsirlərini hiss edə bilərik. Könlümüzü bu təlimlərdən sonra gerçəkləşən hicrətin və daha sonra yaşanan ilahi bərəkətlərin feyzinə aça bilərik.

Xüsusilə, Sevr mağarasında həzrət Peyğəmbər *-səllallahu əleyhi və səlləm-* və həzrət Əbu Bəkir arasındakı mənəvi alış-verişdən pay alar və onların

orada qaldıqları üç gün ərzində ilahi sirlərə qərq olmaq və qəlbi inkişaf etdirmək istiqamətində danışdıqları xüsusi söhbətdə istedadımız ölçüsündə iştirak edə bilərik. O söhbətlə başlayan **«qızıl silsilə»**nin məhəbbət, eşq və vəcd iqlimində könüllərimizə kamil mənada imanın ləzzətini daddıra bilərik.

Bu ləzzəti dadaraq hər biri bir ulduz kimi olan seçilmiş əshaba tabe olar, min bir hikmət və ibrətlə dolu Mədineyi-Münəvvərə xatirələrindən sonra yenidən Məkkeyi-Mükərrəməyə dönüşü, yəni o mübarək məkanın həzrət Peyğəmbər *-səllallahu əleyhi və səlləm-* tərəfindən fəthini xəyal edib gözümüz önündə canlandıra bilərik.

Ətrafdakı dağlara baxarkən Məkkəni fəth etməyə gələn səhabə ordusunun müşriklərin ürəyinə qorxu salmaq üçün çör-çöp yandırıb, onun atəşi ilə  alovlandırdıqları məşəllərin görüntülərini düşüncəmizdə canlandıraraq, sanki o hadisələrdə iştirak edirmiş kimi yuxuya bənzər bir müşahidə aləmində baş verənləri seyr edə bilərik. Bilal Həbəşinin o gün Beytullahın üstünə çıxaraq yanıq səslə oxuduğu azanın səsini eşidərik. Həzrət Peyğəmbərin *-səllallahu əleyhi və səlləm-:*

**«… Haqq gəldi, batil yox oldu…»** *(əl-İsra, 81)* ayəsini oxuyaraq Kəbədəki bütlərin devrilməsini xəyal edə bilərik.

Bundan sonra bizim könlümüzün də bir Kəbə kimi olduğunu, oranın da bir sıra nəfsani məhəbbətlə bütxanəyə çevrilə biləcəyini qavrayıb, həcc iba-dətinin hər mərhələsindən əldə etdiyimiz ruhani və mənəvi bir güclə o bütləri devirməyə, könlümüzü həqiqi mənada bir ilahi nəzərgaha çevirməyə yönələ bilərik.

Belə çoxsaylı təcəllilləri qazanmaq qapısı olan həcc ibadəti hər kəs üçün mənəvi bir arınma, durulma və dirilmə hadisəsidir. Bu dirilişi gerçəkləşdirən həcc vəzifəsi insanı kamil dinə yönəldən böyük bir ibadətdir.

Həcc, varlıq və nəfs örtüklərindən sıyrılaraq ruhani bir həyata addım atmaqdır. Həcc, insan ruhunun ahəngini, iqlimini və rəngini tapdığı, əsl mahiyyətini əldə etdiyi, feyz yağmurları ilə yuyunub arındığı, ruhaniyyət təzahürləri ilə dolu olan bir ibadətdir.

## ƏRƏFAT

Ərəfat bir əfv, yalvarış və sığınma məqamıdır.

Ərəfat, qəbirdən qiyamət sabahına oyanmağı və qrup-qrup məhşər meydanına toplanmağı xatırladır. Bütün qullar Allahın hüzurunda aciz, möhtac və ümidvar olaraq ondan əfv gözləyərlər. Könüllər və

gözlər tövbə yaşları ilə islanar, haqqa doğru səmimi yalvarışlar yüksələr. Həyat dəftərlərində tərtəmiz səhifələr açılar və ömrün bundan sonrakı hissəsinin Allaha itaətlə yaşanacağı ilə bağlı Yaradana söz verilər.

Beləliklə, Ərəfat bir məhşər tablosudur. Qiyamətdəki vəziyyətin bir hissəsi də orada yaşanır. Həqiqətən, ora sanki hər kəsin qəbirdən qalxıb, öz günahlarının peşmançılığı ilə məhşər yerinə gəlişini və çarəsizliklə çırpınaraq Rəbbə könüldən yalvarışını xatırladır. Bu, altda və üstdə bir ağ parça ilə, başıaçıq, ayaqyalın, bütün dünyəvi rütbələrdən soyunma halıdır…

Başqa yöndən, Ərəfat köhnə xatirələri yadımıza salır. Bəllidir ki, qadağan edilmiş meyvəyə toxunmaq günahı nəticəsində uca Allahın istəyi ilə Adəm *–əleyhissəlam-* və Həvva anamız cənnətdən çıxarılıb, bir-birindən uzaq, ayrı-ayrı yerlərə endirilmiş və onlar bir-birinə həsrət qalmışdılar.

Adəm *-əleyhissəlam-*, həzrət Məhəmmədin -səllallahu əleyhi və səlləm- Allah yanındakı şərəf və etibarını düşünərək, nəhayət uca Allahdan onun xatirinə əfv olunmasını istədi. Bundan sonra onun istəyi qəbul edildi və uca Allah ona Məkkə istiqamətində gedən yolu göstərmək üçün bir mələyə göstəriş verdi. Bu duanın bərəkəti ilə Ciddədə yaşayan Həvva anamız da başqa bir

mələyin rəhbərliyi ilə Adəmə *-əleyhissəlam-* doğru yola çıxarıldı və onlar bir ərəfə günü günortadan bir az keçmiş Ərəfat vadisində görüşüb ağladılar və yenidən bağışlanma istədilər, tövbə etdilər.

Ehsan və kərəmi sonsuz olan uca Allah onların dualarını qəbul etməklə birgə, onların nəslindən qiyamətədək hər il eyni gün və eyni saatda oraya gələrək əfv istəyənlərin hamısını bağışlamaq vədini də verdi. Elə hacıların ərəfə günü Ərəfata çıxıb tövbə etmələrinin hikməti də budur.

Bu görüşdən sonra Adəmlə *-əleyhissəlam-* Həvva anamız Allahın əmri ilə bugünkü Məkkə şəhərinin olduğu yeri özlərinə vətən seçdilər. Buna görə də, Məkkə şəhərinin bir adı da yaşayış bölgələrinin anası mənasında olan **«Ümmül-Kura»**dır.

Çünki Məkkə, vətən, rəng, zənginlik, yoxsulluq, geyim kimi fani anlayışların ortadan qaldırılaraq bütün inananların İslam qardaşlığı altında tək bir millət olduğu həqiqətinin təcəlli etdiyi yerdir. Orada rütbəli-rütbəsiz, zəngin-yoxsul, cahil-alim hamı bir arada, eyni paltarlar içində, eyni meydanda və eyni sıradadır. Ora fani olan sinif fərqlərindən sıyrılıb kəfən iqliminə girərək Rəbbə yalvarma, qiyamətin o dəhşətli mənzərəsini seyr etməkdən ürpənmə yeridir.

Bu mübarək məkan təhlükəsizlik, dinclik və məhəbbət qucağı, könülləri feyz, bərəkət və rəhmətlə dolduran peyğəmbərlər yurdudur. Yaşadığımız dövrdə İslam aləminin bütün ağrı-acılarına baxmayaraq, o mübarək məkanlarda həcc və ümrə zamanı gerçəkləşən birlik, qardaşlıq və məhəbbət təzahürləri hələ də dünya millətlərinin yalnız xəyal etdikləri bir işdir. Bu millətlər qurduqları millətlərarası təşkilatlarla hər zaman belə bir səviyyəyə çatmağın həsrəti ilə yaşayırlar və bu məsələ ilə bağlı ciddi bir uğur da əldə edə bilməyiblər. Çünki onlar həddən artıq zəngin yaşamalarına və maddi rifah içində olmalarına baxmayaraq, mənəvi tənəzzülləri səbəbi ilə gah onların içində, gah da onlardan kənarda saysız-hesabsız ayrılıq, kin, düşmənçilik, zülm, haqsızlıq, ədalətsizlik və imtiyaz rüzgarları əsir.

## MÜZDƏLİFƏ VƏ QURBAN

Ərəfatdan sonrakı dayanılacaq yer Müzdəlifədir. Müzdəlifə, Qurani-Kərimdə də işarə edildiyi kimi, **«əl-Məşarul-Həram»**ın ruhaniyyəti ilə rəhmət təzahürlərinin dolu olduğu bir məkandır. Bu yer qəlbləri Rəbbin əzəmət və qüdrət təcəllilıəri ilə yoğurub dünyanı, hətta, axirəti belə nəzərə almayaraq, böyük bir məhəbbət və təslimiyyət içində yalnız Allaha yönəlməyin təlim yeridir.





Adak günləri başa çatdıqdan sonra İbrahimin *-əleyhissəlam-* mənəvi qurbanını təmsil edərək kəsilən cismani qurban hacıların könül dəryasında o uca Peyğəmbərin duyğu və hissiyatını dalğalandıran bir rəhmət, bir hikmət əsintisidir. Bu təmiz hava ilə nəfəs alanların dilləri Xəlilullahın Qurani-Kərimdə bəyan edilən bu sözlərini söyləyir:

«Mən, həqiqətən, batildən haqqa tapınaraq (dönərək) üzümü göyləri və yeri yaradana çevirdim. Mən (Allaha) şərik qoşanlardan deyiləm!». (əl-Ənam, 79)

«De: «Mənim namazım da, ibadətim də, həyatım və ölümüm də aləmlərin Rəbbi Allah üçündür! Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən ilk müsəlmanam!». (əl-Əraf, 162-163)

Həzrət İbrahim *-əleyhissəlam-* Babildən Şama doğru gedərkən:

*«(İbrahim oddan xilas olduqdan sonra) dedi:* **«Mən Rəbbimə doğru (Allahın mənə buyurduğu yerə-Şama tərəf) gedirəm. O, mənə doğru yolu mütləq göstərəcəkdir!».** *(İbrahim müqəddəs torpağa yetişdikdən sonra dua edib) dedi:* **«Ey Rəbbim! Mənə salehlərdən olan** *(bir övlad)* **bəxş et!».** *(əs-Saffat, 99-100)*

Burada qəlbdən, yəni mənəvi aləmdən ən uca Dosta doğru bir vüsal yolçuluğunun olduğuna işarə var.

Mübarək ayənin davamında həzrət İsmayılın mücdələnməsi və qurban hadisəsi zikr edilir:

**«Biz də ona həlim xasiyyətli bir oğlan uşağı** *(İsmayıl)* **ilə mücdə verdik».** *(əs-Saffat, 101)*

**«O, yüyürüb qaçmaq** *(atasına kömək edə bilmək)* **çağına** *(on üç yaşına)* **çatdıqda** *(İbrahim)* **dedi: «Oğlum! Yuxuda gördüm ki, səni qurban kəsirəm. Bax, gör** *(bu barədə)* **nə fikirləşirsən?!» O dedi: «Ata can! Sənə nə əmr olunursa, onu da et. İnşallah, mənim səbirlilərdən olduğumu görəcəksən!».** *(əs-Saffat, 102)*

**«Onların hər ikisi** *(Allahın əmrinə)* **təslim olduğu və** *(İbrahim İsmayılı qurban kəsmək üçün)* **üzüstə yerə yıxdığı zaman Biz ona belə xitab etdik: «Ey İbrahim! Artıq sən röyanın düzgünlüyünü** *(Allah tərəfindən olduğunu)* **təsdiq etdin!»** *(Sənə yuxuda nə əmr olunmuşdusa, onu yerinə yetirdin. Allah sənə lütf edərək oğlunun yerinə bir qoç kəsməyi buyurur).* **Biz yaxşı iş görənləri belə mükafatlandırırıq. Şübhəsiz, bu, açıq-aydın, bir imtahan idi».** *(əs-Saffat, 103-106)*

**«Biz ona böyük bir qurbanlıq** *(Habilin qurbanlıq qoçunu)* **əvəz verdik. Sonradan gələnlər**

**arasında onun üçün** *(yaxşı ad, gözəl xatirə)* **qoyduq.** *(Onu belə yad edirlər:)* **«İbrahimə salam olsun!». Həqiqətən, Biz yaxşı əməl sahiblərini belə mükafatlandırırıq! Şübhəsiz, o, Bizim mömin bəndələrimizdən idi!».** *(əs-Saffat, 107-111)*



Həzrət İbrahim *-əleyhissəlam*-Həcər anamızla İsmayılı *-əleyhissəlam-* Məkkəyə yerləşdirdikdən sonra Sara anamızın yanına qayıtdı. O, hərdən onların yanına gedirdi. Bir dəfə Məkkədə olarkən bir yuxu gördü. Yuxusunda ayədə buyurulduğu kimi İsmayılı -əleyhissəlam- qurban kəsirdi. İbrahim *-əleyhissəlam-* bu yuxunun şeytani, yoxsa Allaha bağlı bir yuxu olmasını müəyyən edə bilmədi. Onun ürəyində şübhələr yarandı. Ancaq o, eyni yuxunu üç gecə gördü. Bu günlər həcc mövsümünün ərəfədən öncəki, ərəfə və bayramın birinci günü idi.

Rəvayətə görə, bir vaxtlar İbrahim *-əleyhissəlam-:*

*«Allah mənə bir oğul versə, onu qurban edəcəyəm!»,*-demişdi. O, elə bu sözünə görə də sınağa çəkilmişdi.

İbrahim *-əleyhissəlam-* Rəbbindən gələn ilahi əmrə uyğun olaraq Həcər anamıza bildirdi ki, İsmayılı çimizdirsin və onun üzərinə gözəl ətir səpsin. O, İsmayılı bir dostunun yanına aparacağını söylədi. Həzrət İsmayıla da bildirdi ki, özü ilə ip və





bıçaq götürsün:

*«Oğlum, Allah rizası üçün qurban kəsəcəyəm!»,-* dedi.

Ərəfatda hacıların vəqfəyə durduğu yerə doğru getməyə başladılar. Bu vaxt şeytan insan qiyafəsində Həcər anamızın yanına gəldi və Ona:

*«-İbrahimin oğlunu haraya apardığını bilirsən-mi?,*-dedi.

O da:

- *Dostunun yanına aparır,*-cavabını verdi.

Şeytan:

- *Xeyr, onu qurban kəsməyə aparır,*-dedi.

Həcər anamız:

- *O, oğlunu çox sevir!,*-deyə cavab verdi.

Şeytan:

- *Allah əmr etdiyi üçün onu qurban kəsəcək!,*- dedi.

Həcər anamız:

*-Əgər Allah -cəllə cəlalühü- əmr edibsə, bu, gözəl bir şeydir, təvəkkül edərik,*-dedi.

Şeytan Həcər anamızı aldada bilmədi. O, İsmayılın *-əleyhissəlam-* yanına getdi. Bu dəfə də





ondan soruşdu:

- *Atanın səni haraya apardığını bilirsənmi?*

İsmayıl *-əleyhissəlam-:*

- *Allahın əmrini yerinə yetirməyə,*-dedi.

Şeytan:

- *Bilirsən ki, o, səni qurban kəsməyə aparır?!,*-deyərək vəsvəsə verməyə çalışdı.

Bundan sonra həzrət İsmayıl:

-*Rədd ol, məlun! Biz Rəbbimizin əmrini sevə-sevə yerinə yetiririk!,*-deyərək şeytanı qovdu, ona daş atdı.

Şeytan İsmayılı *-əleyhissəlam-* aldada bilmədi. O, bu dəfə İbrahimə *-əleyhissəlam-* üz tutdu:

- *Ey qoca! Oğlunu hara aparırsan? Şeytan səni yuxuda aldadıb! O gördüyün yuxular şeytani röyalardır,*-dedi.

İbrahim *-əleyhissəlam-:*

- *Sən şeytansan! Tez yanımızdan uzaqlaş!,*-dedi.

**İbrahim** *-əleyhissəlam-* **əlinə yeddi daş götürdü və üç ayrı yerdə ona daş atdı».**

Həcc ziyarəti zamanı qiyamətədək bir şərt

olaraq davam edəcək şeytana daş atmaq ənənəsi bu şəkildə başladı. Bu hal onların təvəkkül və təslimiyyətinin bir əlaməti olaraq Məhəmməd ümmətinə nümunə oldu.

İbrahim *-əleyhissəlam-* oğlu İsmayıl -əleyhissəlam-ilə birlikdə Minadan Ərəfata doğru gedərkən səmadakı mələklər çox həyəcanlandılar. Onlar heyrətlə bir-birinə:

*«-Sübhanallah! Bir Peyğəmbər başqa bir Peyğəmbəri qurban kəsməyə aparır!,*-dedilər.

İbrahim *-əleyhissəlam-* oğlu həzrət İsmayıla bu işin həqiqətini anlatdı:

- *Ey oğlum! Yuxumda səni qurban kəsməklə əmr olundum,*-dedi.

İsmayıl *-əleyhissəlam-:*

- *Əziz atam, bunu sənə Allah əmr etdimi?,*-deyə soruşdu.

İbrahim *-əleyhissəlam-:*

- *Bəli!,*-dedi.

Bundan sonra İsmayıl *-əleyhissəlam-:*

- *Əziz atam! Əgər belədirsə, sən əmr olunduğun şeyi yerinə yetir! İnşallah, mənim səbir edənlərdən olduğumu görəcəksən!»,*-dedi.

Canını fəda etməyə hazır olduğunu bildirdi. O zaman İsmayılın *-əleyhissəlam-* cəmisi yeddi, ya da on üç yaşı var idi.

Rəvayətə görə, Cəbrailin *-əleyhissəlam-* həyəcanlandığı və özünü çatdırmaqda çətinlik çəkdiyi üç yerdən biri İbrahimin *-əleyhissəlam-* oğlu İsmayılı qurban kəsmək üçün bıçağı boğazına toxundurduğu an oldu. O an Cəbrail *-əleyhissəlam-* bıçağın ağzını koraltdı. Uca Allaha təslim olduqlarına görə ilahi bir lütf olaraq onlara cənnətdən gətirdiyi bir qoçun qurban ediləcəyini bildirdi. Beləliklə, ürəkdən gələn təkbirlərlə o qoçu qurban kəsdilər.

Bu baxımdan qurban kəsməkdə əsl məqsəd bu hadisələri xatırlayıb, onlardakı ilahi hikmətlərdən ibrət almaq, Allaha təslimiyyət və təqva ilə qulluq etməsi üçün könülləri xəbərdar etməkdir. Uca Allah buyurur:

**«Onların nə əti, nə də qanı, əlbəttə, Allaha çatmaz. Allaha çatacaq olan yalnız sizin təqvanızdır…».** *(əl-Həcc, 37)*

Başqa yöndən həcdə qurban kəsildikdən sonra saçın kəsilməsinin də (təraş edilməsinin) ayrı bir hikməti var. İslamdan əvvəl bir şəxs köləsini azad edəndə onun saçını ülgüclə təraş edərdi. Bu da köləliyin bir əlaməti olaraq edilirdi. Həcdəki təraş

ilə də hacılar uca Allahın daimi köləliyini, qulluğunu qəbul və etiraf etmiş olurlar. Yəni bu təraş müəyyən mənada özümüzü Allaha həsr etməyimizin və Ona təslim olmuş bir qul olduğumuzun rəsmiləşdirilməsi mahiyyətində olan bir bağlılıq ifadəsidir.

## MİNA və ŞEYTAN DAŞLAMA

Həzrət İbrahim və həzrət İsmayılın şeytanı daşlayaraq ona qalib gəldikləri yer olan Mina qulun istənilən halda Rəbbinə qarşı təvəkkül və təslimiyyət duyğuları ilə yaşamasının zəruri olduğunu təlqin edən mübarək bir məkandır.

Şeytan daşlamaq isə hər şeydən öncə və daha çox insanın içindəki şeytana daş atmaqla başlayır. Daha öncə də ifadə etdiyimiz kimi, şeytan həzrət İbrahim, həzrət İsmayıl və Həcər anamıza vəsvəsə vermək üçün onların arxasınca düşmüşdü. Həccin vacib bir şərti olan şeytan daşlamaq da onların şeytanı qovub daşa basmalarının bir xatirəsidir.

Şeytana daş atmaq müəyyən mənada lənət etmək mənasındadır. Çünki o dövrlərdə lənət etmək daş atmaq vasitəsi ilə həyata keçirilirdi. Belə ki şeytana «rəcim», yəni daş atılmış, daşa basılmış deyilməsi onun lənətləndiyini ifadə etmək üçündür.

Bunu da bildirmək zəruridir ki, burada forma baxımından yerdən götürülüb atılan daş, əslində, günaha atılmış bir daşdır. Əsl niyyət uca Allahın

rizasını qazanmaqdır. Rəsulullah *-səllallahu əleyhi və səlləm-* belə buyurmuşdur:

**«(Şeytan) daşlamaq və Səfa ilə Mərvə arasında gedib-gəlmək ancaq Allahın zikrini yerləşdirmək üçün əmr edilmişdir».** *(Tirmizi, «Həcc», 64/902)*

Xırda daşları atmaqda məqsəd şeytana nifrət etdiyimizi bildirmək üçündür. Çünki o, həzrət Adəmə torpaqdan yaradıldığı üçün yuxarıdan aşağı baxmış, özü atəşdən yaradıldığına görə üstünlük iddiası irəli sürmüş və təkəbbürlənmişdi. Uca Allah da onu tərkibində onun yuxarıdan aşağı baxdığı torpaq olan bir cisim ilə (daşla) daşa basdırmışdır.

Burada şeytana daş atarkən yaşadığımız duyğu və düşüncələr bütün həyatımızı əhatə etməlidir. Şeytanın qəlbə üfürdüyü hər vəsvəsəni:

اَعُوذُ بِاللهِ مِنَ الشَّيْطَانِ الرَّجِيمِ

**«Daşa basılmış şeytanın şərindən Allaha sığınıram»** ifadəsi ilə zərərsizləşdirmək lazımdır. Beləliklə, son nəfəsədək hər zaman şeytanı daşlamaq zəruridir. Uca Allah buyurur:

**«Əgər sənə Şeytandan bir vəsvəsə gəlsə** *(fəsad toxunsa),* **Allaha sığın!..»** *(Fussilət, 36)*

Bir sözlə, şeytan daşlamaq, iblisin lənətlənməsi, könlün hər cür qəflət və vəsvəsədən azad bir şəkildə Allaha yönəlməsidir.

Həcc və ümrə ibadəti zamanı bunu da unutmamaq lazımdır:

Oğrular qızıl dükanlarını qoyub, nimdaş şeylər satan bir şəxsin dükanına girməyə cəhd göstərməzlər. Çünki sərvət içində qiymətli ləl-cəvahirat olan qızıl dükanında olar. İbadət əhli olan bir mömin ilə ibadətdən uzaq qafil bir insan da buna bənzəyir. İnsanlığı yoldan çıxartmaq üçün uca Allahdan icazə almış şeytan daha çox ibadəti olanın arxasınca qaçar. Buna görə də, həcc və ümrəyə getməyi niyyət edən bir şəxsə daha qəzəbli bir şəkildə təcavüz edər. Bu baxımdan, həccə gedənlərin ilk götürəcəkləri silah «səbir» olmalıdır. Çünki həcc başqa ibadətlərdən fərqli bir ibadətdir. İlk baxışda adama asan gəlir. Ancaq ən çətin ibadətlərdən biridir. Buna görə də, niyyət cümləsində:

**«Allahım! Onu mənə asanlaşdır!..»** ifadəsi də var.

Həcc və ümrədə:

لَبَّيْكَ أَللَّهُمَّ لَبَّيْكَ، لَبَّيْكَ لاَ شَرِيكَ لَكَ لَبَّيْكَ،
إِنَّ الْحَمْدَ وَالنِّعْمَةَ لَكَ وَالْمُلْكَ لاَ شَرِيكَ لَكَ

deyərək, Haqqa yalvaran könüllər **«Ləbbeyk, Allahümmə Ləbbeyk…»** *(«Buyur! Əmr et! Əmrinə hazıram, Allahım!»)* ifadələri ilə Rəbbin dəvətini

1. Səy: Səfa və Mərvə təpələri arasında gedib-gəlmək.





qəbul etdiyini və Onun mülkündə Ondan başqa Allah olmadığını təsdiq etdiyini bilməlidir. Anlamalıdır ki, o, bir daha şeytanın və şəxsi mənfəətlərinin istəklərinə yönəlməməyə söz vermişdir.

Bu baxımdan, möminin vəzifəsi şeytanın hər cür təxribatlarına qarşı ayıq-sayıq olmaqdır. Bununla birgə, mömin bu məşəqqətli səfər zamanı qarşıya çıxacaq hər cür çətinlikləri görüb bezməməlidir. O, səbir etməli və bu qarşıya çıxan çətinliklərin bir imtahan olduğunu düşünərək həcc və ümrə ibadətinin ruhaniyyətini zədələməkdən çəkinməlidir.

## SƏFA, MƏRVƏ və SƏY[1]

Səfa və Mərvə təpələri bugünkü Zəmzəm quyusunun olduğu yerdə susuzluq nəticəsində əldən düşmüş İsmayılın *-əleyhissəlam-* anası həzrət Həcərin qorxu və həyəcan içərisində su tapmaq məqsədi ilə gedib-gəldiyi iki mübarək təpədir. Buna görə də, Səfa ilə Mərvə arasında gedib-gəlmək insanın uca Allaha böyük bir səmimiyyət, heçlik və acizlik duyğuları ilə yalvarmasının hikmətini ifadə edir. Elə buna görə də, bu ibadət həccin əsaslarına **«səy»** adı ilə daxil edilmişdir.

Uca Allah bu iki təpənin önəmini belə ifadə edir:

إِنَّ الصَّفَا وَالْمَرْوَةَ مِن شَعَآئِرِ اللهِ

**«Şübhəsiz, Səfa ilə Mərvə Allahın nişanələrindəndir...».** *(əl-Bəqərə, 158)*

Möminlərin Allahın nişanələri qarşısındakı davranış ölçülərini də yenə Rəbbimiz belə bəyan etmişdir:

**«... Hər kəs Allahın mərasiminə (həcc əməllərinə, ya da qurbanlıq heyvanlara) hörmət etsə, bu (hörmət), şübhəsiz, qəlblərin təqvasındandır (Allahdan qorxmasındandır).»** *(əl-Həcc, 32)*

## KƏBEYİ-MÜƏZZƏMƏ

Möminlərin qibləsi Kəbeyi-Müəzzəmə uca Allahın Qurani-Kərimdə:

**«...Səcdə et və yaxınlaş!»** *(əl-Ələq, 19)* buyruğu ilə yerinə yetirilməsini əmr etdiyi namaz ibadətinin istiqamət hədəfidir. Eyni zamanda bütün müsəlmanların ortaq diqqət nöqtəsi, yəni İslam dünyasının nəbzinin vurduğu yerdir. İlahi nəzərlərin insandakı təcəlli məkanı qəlb olduğu kimi, kainatdakı təcəlli yeri də Kəbədir. Yəni kainat içində Kəbə bir növ insan bədənindəki qəlb kimidir. Buna görə də, həcc Kəbənin ehtişamını idrak edərək





qəlb həyəcanı ilə yerinə yetirilməsi zəruri olan bir ibadətdir.

Beytullah, yəni Allahın evi olaraq tanınan Kəbənin Adəmdən *-əleyhissəlam-* başlayaraq müqəddəs bir məbəd olduğu və gücü çatanların oraya həcc ziyarətinə getməsinin fərz hökmündə əmr edildiyi mübarək ayədə belə bildirilir:

**«Həqiqətən, insanlar üçün ilk bina olunan ev** *(məbəd)* **Bəkkədəki evdir ki, o, şübhəsiz, bütün aləmlərdən ötrü bərəkət və doğru yol qaynağıdır. Orada aydın nişanələr-İbrahimin məqamı var. Ora daxil olan şəxs əmin-amanlıqdadır** *(təhlükədən kənardır). (Yemək, azuqə, sağlamlıq, minik baxımından)* **yoluna qüvvəsi çatan hər bir kəsin həccə gedib o evi** *(Kəbəni)* **ziyarət etməsi insanların Allah qarşısında borcudur. Kim bunu** *(bu borcu)* **inkar edərsə** *(özünə zülm etmiş olar).* **Əlbəttə, Allah aləmlərə** *(heç kəsə)* **möhtac deyildir!».** *(Ali-İmran, 96-97)*

Kəbeyi-Müəzzəmədə **«Məqami-İbrahim»**, yəni Xəlilullah olan İbrahimin *-əleyhissəlam-* məqamı var. Uca Allah həcc, ya da ümrə nəsib etdiyi möminlərə onun ayaq izlərinin olduğu o mübarək məkanda gəzmək və onun məqamının arxasında təvaf namazı qılmaq vəzifəsi yükləmişdir.

Kəbədə salamlayaraq hörmətlə öpülən **«Hə-**

**cəri-Əsvəd**»də Allaha beyət edərək Ona qulluq və itaət məsələsi ilə bağlı söz vermək məqamı olan mübarək bir daşdır. Onu salamlamaq, eyni zamanda bütün nəfsani təmayüllərdən və şeytani duyğulardan əl çəkməkdir.

Həcəri-Əsvəd təvafın başlanğıc və sonunu müəyyən edir. Kəbənin bu günədək, demək olar ki, bütün daşı dəyişdirilmişdir. Ancaq Həcəri-Əsvəd dəyişdirilmədən indiyədək yerində qalmışdır. Onu başda peyğəmbərlər sultanı olan həzrət Məhəmməd *-əleyhissəlatü vəssəlam-* olmaqla çox mübarək insanlar öpmüş, çox mübarək əllər ona toxunmuşdur. Beləliklə, o adi bir daş olduğu halda, malik olduğu uca dəyəri ilə könüllərimizdə tamamilə başqa bir təsir və sevgi qönçəsi olmuşdur.

Bir sözlə, bütün xüsusiyyətləri ilə Kəbə, sanki ilahi ərşin yer üzündəki kölgəsi, rəhmət və bərəkət qaynağıdır. Başqa bir ifadə ilə desək, uca Allahın rəhmət və bağışlama sifətlərinin əks etdiyi parlaq bir aynadır. O, könülləri işıqlandıran bir günəş, yəni nur qaynağıdır.

Kəbənin tikilməsi ilə bağlı olan rəvayətlərə görə, həzrət Adəm ilə Həvva anamız cənnətdən çıxarıldıqları zaman yer üzündə- Ərəfatda görüşüblər. Onlar birlikdə qərbə doğru hərəkət edərək Kəbənin olduğu yerə gəlirlər. Bu zaman Adəm *-əleyhissəlam-* bu görüşün şükür borcunu yerinə

yetirmək üçün Rəbbinə ibadət etmək istəyir. O, cənnətdə olarkən ətrafında təvaf edərək ibadət etdiyi nurdan olan sütunun yenidən ona verilməsini istəyir. Nurdan olan sütun o yerdə təcəlli edir və həzrət Adəm onun ətrafında təvaf edərək Allaha ibadət borcunu yerinə yetirir.

Bu nurdan olan sütun həzrət Şit *-əleyhissəlam-* zamanında yoxa çıxır, onun yerində qara bir daş qalır. Bundan sonra həzrət Şit onun yerində daşdan, onun kimi dörd küncü olan bir bina tikir və o qara daşı binanın bir küncünə yerləşdirir. Bu gün Həcəri-Əsvəd deyilən qara daş da budur.

Sonra Nuh tufanında bu bina uzun bir müddət qumun altında gizli qalır. Həzrət İbrahim *-əleyhissəlam-* Allahın əmri ilə Kəbənin olduğu yerə gedir, oğlu İsmayılı *-əleyhissəlam-* anası ilə birlikdə oraya yerləşdirir. Sonra İsmayıl *-əleyhissəlam-* ilə birgə Allahın əmrinə uyğun olaraq Kəbənin olduğu yeri qazır. Həzrət Şitin tikdiyi binanın bünövrəsini tapır və o bünövrənin üzərində Kəbeyi-Müəzzəməni tikir.

İbrahim *-əleyhissəlam-* Kəbəni tikib qurtarandan sonra uca Allaha belə dua etmişdir:

**«… Ey Rəbbim, buranı bəladan asudə (uzaq) bir şəhər et, əhalisinin Allaha və axirət gününə inananlarına cürbəcür meyvələrdən ruzi ver!...».** *(əl-Bəqərə, 126)*

İbrahimin-*əleyhissəlam*- bu duasının bərəkəti olaraq Məkkədə əgər belə demək mümkünsə, iman ləzzəti ilə ağzın dadı iç-içədir.

Kəbə təxminən on bir dəfə tikilmişdir:

Birinci dəfə mələklər, ikinci dəfə Adəm-əleyhissəlam-, üçüncü dəfə Şit -*əleyhissəlam*-, dördüncü dəfə İbrahim -*əleyhissəlam*-, beşinci dəfə Amalika qəbiləsi, altıncı dəfə Cürhümilər, yeddinci dəfə Kusay, səkkizinci dəfə Qureyş, doqquzuncu dəfə Peyğəmbərin səhabələrini görən nəsildən olan Abdullah bin Zübeyr, onuncu dəfə Həccaci-Zalim və on birinci dəfə də Osmanlı sultanı IV Murad Xan tərəfindən tikilmişdir.

Osmanlının Kəbeyi-Müəzzəməyə göstərdiyi müstəsna ədəb və nəzakət ölçüləri bu təmir zamanı da özünü göstərmişdir. Belə ki IV Murad dövründə bir sel olur və Kəbənin iki tərəfində çökmə meydana gəlir. Bundan sonra dərhal təmir üçün baş memar Rıdvan Ağa Məkkəyə göndərilir. Zəruri olan işləri təsbit edən baş memar çökən yerləri sadalayarkən Kəbəyi-Müəzzəmə haqqında «yıxılma və çökmə» kimi ifadələrdən istifadə etməyi ədəbə uyğun saymır və belə bir sözdən istifadə edir:

*«Kəbətullahın filan, filan hissələri səcdəyə doğru enmişdir».*

Bundan başqa, təmir əsnasında da tikinti üçün zəruri olan materialları daşıyan heyvanların

bu mübarək məkanları bulaşdırmaması üçün bir sıra tədbirlərin görülməsi kimi diqqətəlayiq ədəb ölçüləri nümayiş etdirilmişdir.

## ƏCƏL GƏLİB ÇATMADAN ...

Unutmamalıyıq ki, həyat neməti insana bir dəfə lütf edilmişdir. Ölüm də Allahın bütün fanilər üçün zəruri etdiyi bir qanundur. Zamanına, dəqiqəsinə və nəfəs sayınadək müəyyən olunmuş və hökm verilmişdir. Əcəlin irəli-geri getmədiyi, nə vaxtından əvvəl, nə də gecikərək baş verməyəcəyi açıq bir həqiqətdir. Əcəldən qaçanların xilas olduqları ilə bağlı indiyədək bir xəbər də eşidilməmişdir.

Buna görə də, həcc ziyarətini yerinə yetirməyə borclu olanlar bu həqiqətləri dərindən düşünüb bu böyük ibadətə qarşı laqeydlik və səhlənkarlıq göstərməkdən qətiyyətlə uzaq qaçmalıdırlar. Çünki ömür sona çatdıqdan sonra peşmançılığın bir faydası yoxdur. Ona görə də, fürsət tapan kimi Rəbbimizin üzərimizdəki böyük bir haqqı olan həcc ibadəti ilə bağlı qəflət göstərməməli, ilk fürsət ələ düşən kimi bu qulluq borcumuzu yerinə yetirməliyik. Əks halda, həzrət Peyğəmbərin -*səllallahu əleyhi və səlləm*- xəbərdarlığı müdhiş və qorxuncdur:

**«Bir kimsə yeyəcək, içəcək və minik xərclərinə malik olub, Beytullaha getmək mümkün olduğu**

**halda, həcc etməsə, onun yəhudi, ya da xristian olaraq ölməsinə heç bir maneə yoxdur!»** *(Tirmizi, «Həcc», 3)*

Bu Peyğəmbər xəbərdarlığı həcc ziyarətinə getmək üçün zəruri olan bütün imkanlara sahib olub, ancaq bu ibadətə laqeyd yanaşanların dəhşətli bir itki ilə üzləşəcəklərini bəyan edir. Belə halda, imkanı olan möminlərin həcc ibadətinə biganə yanaşmaları çox böyük bir qəflətdir!...

İmkanı olan hər möminin ömründə bir dəfə həccə getməsi fərzdir. Bir neçə dəfə həccə getmək isə yaxşı əməl sayılır və savabı çox böyükdür. Allah Rəsulu *-səllallahu əleyhi və səlləm-* belə buyurmuşdur:

**«Həcc ziyarəti ilə ümrə ziyarətini bir-birinin ardınca həyata keçirtmək ömrü və ruzini artırır, yoxsulluğu və günahı körüyün dəmirdəki pası apardığı kimi yox edir».** *(Əhməd, III, 446-447)*

Başqa bir mübarək hədisdə də belə buyurulur:

**«Uca Allah buyurur: «Mən bir quluma sağlamlıq və rahatlıq ehsan edib ruzisini də bol verdiyim halda, o hər dörd ildə bir dəfə Mənim yanıma gəlməsə** *(yəni həcc, ya da ümrə ziyarətinə getməsə),* **o şəxs, həqiqətən, məhrum bir adamdır».** ***(Heysəmi, III, 206)***

Göründüyü kimi, fərz ibadətlər olan namazın, orucun nafiləsi olduğu kimi, həccin də nafiləsi var. Nafilə edilən həcc ibadətləri ilə bağlı kor-koranə

irəli sürülən tənqidi fikirlər, Allah qorusun, bir ucu küfrə meyl edən sözlərdir. Bunlar əsası olmayan cahil fikirlərdir, iman və ibadətin həqiqi ləzzətindən məhrum olmağın qara ifadələridir.

Nafilə ibadətlər səadət əsrindən bəri böyük bir iman vəcdi ilə yerinə yetirilir. Belə ki həzrət İmam Əzəmin 55 dəfə həcc ziyarətinə getdiyini söyləmək bu məsələ ilə bağlı tutarlı bir misaldır. Həzrət İmam Əzəm Əbu Hənifə, onun çoxsaylı tələbəsi və bir çox işlərinin olmasına baxmayaraq, vaxtının təxminən üçdə birini həcc səfərinə ayırmışdır. O zamankı şərtlərə görə dəvə ilə Bağdaddan yola çıxaraq Məkkeyi-Mükərrəmə və Mədineyi-Münəvvərəni ziyarət etməyin çox məşəqqətli bir səfər olduğunu da düşünmək lazımdır. Bu Haqq dostları başqa yerlərdə olmayan o mənəvi havanın Hərameynin bərəkətli iqlimində olduğunu bildiklərindən ələ fürsət düşən kimi həccə getməyi və Rəsulullahı -səllallahu əleyhi və səlləm- ziyarət etməyi böyük bir qənimət saymışlar.

Çünki böyük bir iman həyəcanı ilə yerinə yetirilən nafilə ibadətlər qulu Allaha yaxınlaşdırır, ruhu dərinləşdirir. Uca Allah belə mömin qullarının görən gözü, eşidən qulağı olur. Yəni onların görməsi, duyması, düşüncəsi və sözləri hər zaman ilahi nur selinə çevrilir.

## TƏVƏKKÜL VƏ TƏSLİMİYYƏT

Həcc, proqramı baxımından insanı mənəvi həssaslığa yönəldir. Belə ki Beytullah, İbrahim -*əleyhissəlam*- və ailəsinin təvəkkül və təslimiyyət xatirələri ilə dolu olan bir məkandır. Təvəkkül, təslimiyyət və həcc kəlmələri deyiləndə İbrahim -əleyhissəlam- və İsmayıl -*əleyhissəlam*- yada düşür. Bu baxımdan bir sıra şərti ilə həcc onların ixlasının bərəkəti ilə qiyamətədək təkrar ediləcək bir saleh əməldir.

Təvəkkül, lüğətdə «*dayanma, etibar etmə, vəkil tutma və vəkilə inanmaq*» mənalarında işlədilir. Təsəvvüfdə isə könlü Allah ilə dolu olan kimsənin yalnız Ona inanması və sığınmasıdır.

Uca Allah, Musadan -*əleyhissəlam*- onun əlindəki əsanı soruşmuş, sonra **«Onu əlindən at!»,**- deyə əmr etmişdir. Çünki əsa Onun Rəbbinə olan təvəkkülünə kölgə salırdı.

Mübarək ayədə belə buyurulur:

**«… İnananlar ancaq Allaha təvəkkül etsinlər!»** *(İbrahim, 11; ət-Tövbə, 51)*

**«… Əgər möminsinizsə, yalnız Allaha təvəkkül edin!»** *(əl-Maidə, 23)*

**«… Kim Allaha təvəkkül etsə, Allah ona yetər!..»** *(ət-Talaq, 3)*

Mübarək hədisdə də belə buyurulur:

**«Əgər siz həqiqətən təvəkkül edə bilsəniz, səhər tezdən qarnı ac** *(olaraq çıxıb)*, **axşam tərəfi tox (olaraq dönən) quşların bəsləndiyi kimi qidalanarsınız!»** *(Tirmizi, «Zühd», 33)*

Təvəkkül, tədbir və təşəbbüsləri bir kənara atmaq deyil, əksinə, onları yerinə yetirdikdən sonra Allaha sığınmaqdır.

Uca Allah buyurur:

**«... Hər hansı bir işdə onlarla məsləhətləş, qəti qərara gəldikdə isə Allaha təvəkkül et!..»** *(Ali-İmran, 159)*

Möminlərin hər iki dünyada da yardımçısı Allahdır. Kim Ona təvəkkül edərsə, Allah ona yetər. İstər fərdi, istərsə də ictimai planda olsun, gerçək rahatlıq və səadət yalnız Ona dönməkdə, Ondan yardım istəməkdə, Ona təvəkkül etməkdədir.

Təslimiyyət, سَلِمَ felindən yaranıb. Boyun əymək, başa gələn hadisələri etirazsız qəbul etmək və xilas olmaq mənasındadır.

Belə ki İbrahimin *-əleyhissəlam-* qəlbində Allahdan başqa heç bir şeyə yer yox idi. Buna görə də, uca Allah onu özünə Xəlil, yəni dost etmişdir.

Mələklər:

**«Ey Rəbb! İbrahimin canı, övladı və malı var! O, Sənə necə dost ola bilər?»,**-demişdilər.

Uca Allah da onun üç yerdə etiraz etmədən Allaha təslim olduğunu mələklərə göstərmişdir. Bu imtahanlar və onların nəticələri qiyamətədək ümmətə nümunə olacaq.

İbrahim *-əleyhissəlam-* atəşə atılacağı zaman mələklər onun köməyinə gəlmişdi. Ancaq O:

**«Sizə ehtiyacım yoxdur!.. Atəşə yanmaq gücünü kim vermişdir?»,**-*demiş və* **«Allah nə gözəl vəkildir!»,**-buyuraraq Rəbbinə sığınmışdı.

Onun bu təslimiyyətinin bir mükafatı olaraq atəşə:

**«Ey atəş! İbrahimə qarşı sərin və xətərsiz ol!»** *(əl-Ənbiya, 69)* buyurmuşdu.

İbrahimin *-əleyhissəlam-* malı da Cəbrailin *-əleyhissəlam-* uca Allahı üç dəfə zikr etməsinin nəticəsində onun nəzərində əhəmiyyətsiz bir şeyə çevrilmiş və ona:

**«Al, bunların hamısını götür!»,**-demişdi.

İbrahim *-əleyhissəlam-* övladı İsmayılı qurban etməklə imtahana çəkilmiş və uca Allahın əmrinə qarşı göstərdiyi təslimiyyət ilə bu imtahanı da böyük





uğurla keçə bilmişdi.

Deməli, həqiqi qulluq və təslimiyyət budur. Çünki Allah *-cəllə cəlalühü-* qulunun Ondan başqasına təslim olmasını istəməz.

Təslimiyyət məhəbbətə bağlı olan bir itaətdir. Bu itaət və təslimiyyətin bərəkəti ilə İbrahimə *-əleyhissəlam-* canı, malı və övladı uca Rəbbinin yolunda heç bir maneəyə çevrilə bilmədi. Həcc ibadəti də Onun Rəbbinə təvəkkül və təslimiyyətinin qiyamətədək davam edəcək ən gözəl bir simvolu oldu.

Çünki İbrahimin *-əleyhissəlam-* dili qəlbinə tərcüməçilik edərək hər zaman:

**«… Mən aləmlərin Rəbbinə təslim oldum!»** *(əl-Bəqərə, 131)* deyirdi.

Həzrət İbrahim və həzrət İsmayılın *-əleyhiməssəlam-* təvəkkül və təslimiyyətinin simvolu olan həcc bəşəri sifətlərdən sıyrılaraq bir bağışlanma iqliminə, təslimiyyət və təvəkkülə girişdir. Həcc, məhəbbət dolu bir qulluğun icra edilməsidir.

Həcc ibadəti bizə göstərir ki, günahların yox olması ancaq yalvarış, təvəkkül və təslimiyyət dolu bir qəlb ilə edilən ibadətlərin bərəkəti ilə gerçəkləşir.

Başqa yöndən, həcc və ümrə məqsədi ilə yola çıxanlar təvəkkül və təslimiyyət məsələsini doğru anlamalı, maddi və mənəvi yol hazırlıqlarını ciddi

yerinə yetirməlidirlər. Çünki Yəmən xalqından bir sıra şəxslər həccə gedərkən əbəs yerə: *«Biz Allaha təvəkkül edirik!»*,-deyərək hazırlıqsız yola çıxmışdılar. Onlar Məkkəyə çatanda ac olduqlarına görə, dilənməyə başladılar. Bu hadisədən sonra mübarək ayə nazil oldu:

**«…(Həcc və axirət üçün) tədarük görün. Ən yaxşı tədarük (azuqə) isə təqvadır...»** *(əl-Bəqərə, 197)*

Mübarək ayədən anlaşıldığına görə, o müqəddəs torpaqlarda həm maddi, həm də ondan daha önəmli olan mənəvi azuqəyə ehtiyac yaranır. Bu da, əlbəttə, «təqva»ya qovuşmuş bir sağlam qəlb ilə mümkündür. Çünki Allahın əxlaqı ilə tərbiyə olunmağın ən təbii nəticələrindən biri təqva təzahürləri ilə dolu geniş bir könülə sahib olmaqdır.

## QƏBUL OLUNACAQ, XEYİRLİ BİR HƏCC VƏ ÜMRƏ ÜÇÜN MƏNƏVİ ÖLÇÜLƏR

Həcc və ümrənin Allah yanında qəbul edilən və xeyirli olması üçün zəruri sayılan başlıca ölçülər bunlardır:

1. Həcc və ümrəyə ixlasla (səmimi) niyyət edib, buna zidd olan niyyət və davranışlardan əl çəkmək:

Uca Allahın rizasına nail olub, ilahi lütflərdən istifadə edə bilmək üçün həcc və ümrə ibadətinə

ürəkdən, inanaraq niyyət edib, bu məsələ ilə bağlı uca Allaha söz verərkən içimizdəki nəfsani sözləşməni və bəşəri istəkləri də ləğv etməliyik. O mübarək məkanlarda, xüsusilə, varlıq kitabını bağlamaq və mənlikdən sıyrılmaq zəruridir. Həcc və ümrəyə belə bir duyğu və düşüncə ilə yönələnlər ilahi rəhmət və bərəkəti qazanmaq qapısından keçərək ilahi sirr və hikmətlər sarayına qonaq ola bilərlər. Bu mərhələdən sonra onların vəzifəsi budur:

2. Ehram üçün paltarları çıxararkən masiva (bu dünya) libaslarını da soyunmaq:

Allah rizası istiqamətində həcc və ümrə üçün edilən könül razılaşmasının bir təzahürü, bu məsələdəki ixlas və səmimiyyətin bir təcəllisi olaraq ehram üçün sadəcə zahiri paltarlardan deyil, daxili aləmimizdəki sərvət, şöhrət, məqam və vəzifə ehtiraslarından da sıyrılaraq təqva libasına bürünmək zəruridir. Çünki uca Allah belə buyurur:

**«Nəfsini (günahlardan) təmizləyən mütləq nicat tapacaq!»** *(əş-Şəms, 9)*

O müqəddəs iqlimdə könlü Allaha bağlayıb, dünya işləri ilə məşğul olmaqdan və zəruri ehtiyacdan başqa, küçə-bazar gəzməkdən çəkinmək lazımdır. Çünki bu cür işlərlə məşğul olanda könüllərdə bir laqeydlik və qəflət yaranır. O mübarək məkanların mənəvi iqlimindən istifadə etmək çətinləşir.

Belə ki Allah Rəsulu *-səllallahu əleyhi və səlləm-* həcc ziyarəti başa çatdıqdan sonra Məkkədə qalmaq məsələsi ilə bağlı ondan sual soruşanlara:

**«Məkkə qalmaq yeri deyil. Kənardan gələn şəxslərin həcc ibadətlərini yerinə yetirdikdən sonra Məkkədə qalacaqları müddət (ancaq) üç gündür»** *(Əhməd, IV, 39)* buyurması da bu həqiqəti ifadə etmək üçündür.

Həzrət Ömər də *-radiyallahu anh-* həcc və ümrə ibadətlərini yerinə yetirənlərə vəzifələrini başa çatdırdıqdan sonra təzim duyğularının zədələnərək laqeydlik meydana gəlməməsi üçün tez öz ölkələrinə geri qayıtmalarını tövsiyə etmişdir.

Həcc və ümrədə Kəbənin Rəbbinə yönəlmək və **«... Onun qullarına şah damarlarından daha yaxın...»** *(Qaf, 16)* olduğunu idrak etmək zəruridir. Yenə **«... Allah insan ilə qəlbi arasına girər...»** *(əl-Ənfal, 24)* mübarək ayəsinə uyğun olaraq heç bir şeyin Ondan gizli qalmayacağını anlamaq zəruridir. Yəni dünyəvi, ötəri sevdalardan sıyrılıb qəlbin Haqq ilə birgə olmasına diqqət göstərmək lazımdır. Çünki həcc və ümrənin mahiyyəti budur:

### 3. Maddi və mənəvi baxımdan təmizlənmək

Allah Rəsulu *-səllallahu əleyhi və səlləm-* həcc və ümrəyə bağlı olaraq edilən saleh əməllərlə əldə olunmuş nəticənin nə olduğunu bildirərkən

müəyyən mənada bu mübarək ibadətlərdəki məqsədi də belə açıqlamışdır:

**«Həclə ümrənin arasını birləşdirin. Çünki bunlar günahı körüyün dəmirdəki pası təmizlədiyi kimi təmizləyər».** *(Nəsai, «Mənasiq», 6; İbni-Macə, «Mənasiq», 3)*

Belə bir mənəvi təmizlənməyə, yeniləşməyə və imanın təzələnməsinə yol açan, mübarək hədisdə *«həcc ilə arasının birləşdirilməsi»* tövsiyə edilən «ümrə» ibadəti də çox önəmlidir.

İldə bir dəfə olan və bəlli günlərdə icra edilən həcdən fərqli olaraq, ilin hər hansı bir vaxtında və istənilən qədər edilməsi mümkün olan **«ümrə»** yüksək fəzilətinə görə **«kiçik həcc»** adlandırılır. Bu ibadətin fəzilətini də dərindən anlamağımız zəruridir.

Belə ki Peyğəmbərimiz *-səllallahu əleyhi və səlləm-* ümrə üçün ondan icazə istəyən həzrət Ömərə:

**«Əziz qardaşım, bizi də duana daxil et, bizləri unutma!»,**-buyurmuşdur. *(Tirmizi, «Dəavat», 109/3562)*

Həzrət Ömər -radiyallahu anh- bu sevgi dolu istək qarşısındakı vəziyyətini belə ifadə etmişdir:

*«Rəsulullahın -səllallahu əleyhi və səlləm- bu sözünün əvəzinə mənə dünyanı versəydilər, bu qədər sevinməzdim».* *(Əbu Davud, «Vitir», 23/1498)*

Bu misal başqa hikmətlərlə birgə, digər zamanlarla müqayisədə duaların ümrə ibadətində daha çox qəbul olunduğunu da ifadə edir. Deməli, bərəkətli bir ümrə ibadətində edilən səmimi yalvarışların çox böyük savabı var.

Həcdən sonra və xüsusilə, mübarək Ramazan ayında edilən ümrə ziyarətləri mənəvi təmizlənmənin ən feyzli vasitəsidir. Belə ki Peyğəmbərimiz *-əleyhissəlatü vəssəlam-* mübarək hədisində Ramazan ayında edilən bir ümrənin onunla birgə icra edilmiş bir həcc kimi olduğunu bəyan etmişdir. *(Buxari, «Ümrə», 4; Müslüm, «Həcc», 221)*

Həcc və ümrə ibadətində məqsəd belə böyük bir savab qazanmaq və mənəvi təmizlənmə olduğuna görə, əlbəttə, Hicaz yolçularının diqqət və riayət edəcəyi başqa bir məsələ də budur:

4. Haram və şübhəli şeyləri tərk edərək Hərami-Şərifə ədəblə girmək və dini əlamətlərə təzim göstərmək:

Hər şeydən öncə onu deməliyik ki, bütün ibadət və xeyirlər halal qazancla olmalıdır. Çünki bu ibadətlərin bərəkəti bədənin bəslənildiyi halal qida ilə mümkündür. Xüsusilə, həcc və ümrə ibadətində halal qazancın önəmini ifadə edən bu mübarək hədis çox ibrətlidir:

**«Kim bu Beyti haram qazancdan əldə etdiyi pulla ziyarət edərsə, Allaha itaətdən çıxmış olar. Belə bir insan həccə niyət edər, ehrama bürünərək miniyinin üzəngisinə ayağını basıb, dəvəsini hərəkət etdirdikdən sonra «Ləbbeyk, Allahümmə ləbbeyk» deyərsə, səmadan bir carçı belə səslənər:**

**«Sənə nə ləbbeyk, nə də sədeyk! Çünki sənin qazancın haram, qidan haram, miniyin haramdır. Heç bir savab almadan günahkar olaraq geri dön! Xoşlanmayacağın şeylə qarşılaşacağına görə üzül!»**

**Ancaq insan halal pulla həcc səfərinə çıxar, miniyinin üzəngisinə ayağını basıb, onunla heyvanını hərəkət etdirər və «Ləbbeyk Allahümmə ləbbeyk» deyərsə, səmadan bir carçı belə səslənər:**

**«Ləbbeyk və sədeyk! Sənin ziyarətini qəbul etdim. Çünki sənin miniyin halal, paltarın halal, qidan halaldır. Tez ol, çox böyük savablar əldə etmiş və heç bir günaha batmamış olaraq geri dön! Səni məmnun və şad edəcək şeylə qarşılaşacağın üçün sevin!»** *(Heysəmi, III, 209-210)*

Mübarək hədisin ifadə etdiyi mənaya görə, haram pulla həccə gedib yalnız dili ilə «*Ləbbeyk*» deyənlərin «*La ləbbeyk*» ifadəsindən başqa qismətləri

olmayacağı açıq-aşkardır.

Ona görə də, həcdə birinci şərt halal qazancdır. Ondan sonra da səmimi bir könül... Çünki dildən tökülən hər *«Ləbbeyk»*, yəni *«Buyur Allahım! Əmrinə təslim və hazıram!»* ifadəsi könlü eşqlə yandıracaq bir məhəbbət və vəcdlə olmalıdır. Belə könüldən yüksələn *«Ləbbeyk»* sədaları qulu Haqqa yaxınlaşdırır. Ancaq quru və boş sözlərin heç bir dəyəri yoxdur. Bu baxımdan Peyğəmbərin nəvəsi həzrət Hüseyn -radiyallahu anh-, *«Ləbbeyk»* deyərkən:

*«Eşidəcəyim cavab «La ləbbeyk» olsa, halım necə olar!»*,-deyə həyəcandan saralıb solarmış...

Bir də həcc zamanı başqa haram şeylərdən qətiyyətlə uzaqlaşmaq lazımdır. Uca Allah belə buyurur:

**«Həcc** *(mövsümü)* **məlum olan aylardır** *(şəvval, zülqədə ayları və zülhiccənin birinci on günü).* *(Həmin aylarda)* **həcc ziyarəti vacib olan** *(həcci özünə vacib bilən)* **şəxsə həcdə olarkən** *(qadınla)* **yaxınlıq, söyüş söyüb pis sözlər danışmaq, dava-dalaş etmək yaramaz. Allah gördüyünüz hər bir yaxşı işi bilir.** *(Həcc, ya da axirət üçün)* **tədarük görün. Ən yaxşı tədarük** *(azuqə)* **isə təqvadır** *(pis*

2. Baxın, M. Cəmaləddin el-Qasimi, «Zübdətül-İhya», İstanbul, 1969, s. 94.

*əməllərdən çəkinməkdir)*. **Ey ağıl sahibləri, Məndən qorxun!».** *(əl-Bəqərə, 197)*

Bu mənada «pis söz və mübahisə» kimi şəhvani arzulara qadağa qoyulması ilə birgə, Allahın qullarını incitməməyə də diqqətlə yanaşmaq zəruridir. Çünki orada çox adam olduğuna görə, hacılar hər an bir mömini incitmək təhlükəsi ilə üzləşirlər. Bundan çəkinmək üçün, xüsusilə, təvaf zamanı ədəb və nəzakətə diqqətlə əməl etmək lazımdır. Təvafda fırlanma istiqamətinə zidd hərəkət edərək təvaf edənlərə əziyyət verilməməlidir.

Bundan başqa, Hərami-Şərifin izdihamlı yerlərində, mehmanxana liftlərində kişi-qadın söhbətindən qətiyyətlə çəkinməli, giriş və çıxışlarda nizamlı hərəkət edilməlidir. Orada bir ot qoparmağın belə, qadağan olduğunu yadımızdan çıxarmamalıyıq ki, bəşəri davranışlarımız da bir ibadət vəcdi ilə bizi Haqqa yaxınlaşdırsın. Kobud və sərt davranışlar yerini sevgi, mərhəmət, hörmət, nəzakət və incəliyə verməlidir. Çünki orada edilən qəbahət və günahların xeyir əməllərdə olduğu kimi, qat-qat əvəzinin veriləcəyi də unudulmamalıdır.[2]

Belə həssaslıq, mərhəmət və nəzakət abidəsi olan Peyğəmbərimizin də *-səllallahu əleyhi və səlləm-* üzərində çox durduğu önəmli bir incəlikdir. Belə ki Peyğəmbərimiz *-səllallahu əleyhi və səlləm-* bir gün

həzrət Ömərə *-radiyallahu anh-:*

**«Ey Ömər! Sən güclü və qüvvətli bir adamsan. Həcəri-Əsvədə çatmaq üçün insanları sıxışdıraraq zəiflərə əziyyət vermə! Nə narahat ol, nə də narahat et! Tənha olsan, Həcəri-Əsvədə toxun və öp! Əks təqdirdə, uzaqdan «əl toxundurub öpmə» işarəsi et, tövhid kəlməsi oxuyaraq və təkbir gətirərək keç!»,**-buyurmuşdur. **(Heysəmi, III, 241; Əhməd, I, 28)**

Elə bu əhval-ruhiyyənin bir təzahürüdür ki, həzrət Ömər *-radiyallahu anh-* bir gün Kəbeyi-Müəzzəməyə üz tutaraq belə buyurmuşdur:

**«Sən nə böyüksən** *(ey Kəbə!).* **Sənin şanın çox ucadır. Ancaq həqiqi bir mömінin Allah qarşısındakı şərəfi səndən də üstündür».** *(Tirmizi, «Birr», 85)*

Bu şəkildə qul haqqına və könül incitməməyə əməl etməklə birlikdə, o mübarək məkanlarda zahiri və batini ədəbə də çox diqqət göstərilməlidir. Çünki həcc və ümrənin bir məqsədi də o mübarək məkanlara hörmət göstərmək və oradakı müqəddəs məqamların əziz xatirələri ilə bərəkətlənib könüllərə dərəcə qazandırmaqdır. Mübarək ayədə buyurulur:

**«... Hər kəs Allahın mərasiminə** *(həcc*





*əməllərinə, ya da qurbanlıq heyvanlara)* **hör-mət etsə, bu** *(hörmət),* **şübhəsiz, qəlblərin təqvasındandır** *(Allahdan qorxmasındandır)***».** *(əl-Həcc, 32)*

Buna görə, namaz, məscid, Qurani-Kərim, Məhəmməd azanı kimi müqəddəs varlıqlar ilə Kəbeyi-Müəzzəmə, Səfa, Mərvə təpələri kimi müqəddəs yerlər Allahın bir nişanı (əlaməti) hökmündədir.

Kəbəyə doğru ayaq uzadaraq oturmaq, ya da yatmaq, boş və lüzumsuz sözlər danışmaq, xüsusilə, Qurani-Kərimi diqqətsiz (saymazyana) oxumaq və itaəti zədələyəcək şəkildə onu yerə qoymaq kimi xoş olmayan davranışlardan çəkinmək zəruridir.

Başqa yöndən, o mübarək məkanlarda xəstə-lənən, yolda qalan, imkanlarını itirən, yaxınla-rından uzaq düşən, yəni müşkül vəziyyətdə olan mömin qardaşlarımızın halını anlamağa və dərdlərinə dərman olmağa çalışmaq zəruridir. Bu, eyni zamanda mömin bir könülün üstün xüsusiyyətlərindən sayılan mərhəmət, şəfqət və başqalarını özündən üstün tutmaq anlayışlarının mahiyyətidir. Orada könüllərin ilahi nəzərgah olduğunu düşünüb qəlb qırmamağa, əksinə, imkan daxilində könülləri fəth etməyə çalışmalıyıq.

İbadətlərin və xüsusilə, həccin həqiqətini ancaq zərif və həssas bir qəlbin duya biləcəyini Mövlana -

*kuddisə sirruh-* bu hekayəsi ilə çox gözəl ifadə edir:

*«Ümmətin böyüklərindən Bəyazid Bistami həcc və ümrə üçün Məkkəyə doğru sürətlə gedirdi. O, getdiyi hər bir şəhərdə oranın saleh insanlarını araşdırır:*

*«Bu yerdə bəsirət sahibi, könül gözü açıq olan kim var?»,-deyə qarşısına çıxanlardan soruşurdu. Çünki hara səfər edirsə-etsin, hər şeydən öncə Haqq dostlarını axtarıb tapmağın zəruri olduğuna inanırdı. Çünki uca Allah:*

**«...Əgər bilmirsinizsə, zikr əhlindən soruşun!..»** *(əl-Ənbiya, 7) buyururdu. Musaya -əleyhissəlam- belə, Allahın vergisi olan elmə sahib olan Xızırı ziyarət etmək əmr edilmişdi.*

*Bəyazid hilal kimi süzgün, uzunboylu bir pir gördü. Onda vəlilərin ruhaniyyəti var idi. Gözləri kor idi, qəlbi isə dünya kimi işıq saçırdı.*

*Bəyazid o pirin qarşısında oturdu. Pir ona:*

*- Ey insan, hara gedirsən? Qürbət əşyasını (yəni bədənini) hara aparırsan?,-dedi.*

*Bəyazid də:*

*- Həccə getmək niyyətindəyəm. İki yüz dirhəm də pulum var,-dedi.*

*Pir ona dedi:*

*- Ey insan! O dünya malının bir hissəsini Allah*





*yolunda möhtaclara, qəriblərə və biçarələrə payla! Onların könüllərinə gir və onların dualarını istə ki, ruhunun üfüqü açılsın! Ölümsüz bir ömrə qovuş! İlk dəfə könlünə həcc etdir! Ondan sonra həssas bir könüllə o incə həcc səfərinə davam et!..*

*Çünki Kəbə uca Allahın «xaneyi-birr»idir. (Yəni qulu imanın kamalına qovuşduran və Allaha yaxınlaşdıran bir rəhmət məkanıdır) İslamın şərtlərindən biri olaraq bu beytin ziyarət edilməsi fərzdir. Ancaq insan qəlbi bir sirr xəzinəsidir.*

*Kəbə, Azər oğlu İbrahimin binasıdır. Könül isə «Cəlil» və «Əkbər» olan Allahın nəzərgahıdır. Əgər səndə bəsirət varsa, könül Kəbəsini təvaf et! Daş-torpaqdan tikilmiş sandığın Kəbənin əsl mənası könüldür. (Yəni onun vasitəsilə könlünün Rəbbinə daha yaxın olmasıdır).*

*Uca Allah görünən, bilinən surət Kəbəsini təvaf etməyi kirlərdən təmizlənmiş, arınmış bir könül Kəbəsi qazanmaq üçün sənə fərz etmişdir.*

*Bunu yaxşı bil ki, həcc, yerinə yetirməyə məcbur olduğun Allah əmridir. Ancaq bunu da bil ki, sən Allahın nəzərgahı olan bir könlü incitsən, qırsan, Kəbəyə piyada olaraq getsən belə, qazandığın savab könül qırmağının günahını yuya bilməz!»*

*Bəyazid pirin bu dediklərini başa düşdü. Könlü söhbət nəticəsində mərhəmətin sirlərindən bir pay aldı.*

*Rahatlıq və vəcd içində həcc səfərinə davam etdi».*

Bu və buna bənzər gözəl misallarla könülləri istiqamətləndirən həzrət Mövlana o mübarək torpaqlara gedənlərə belə buyurur:

*«Həcc vaxtı gələndə Kəbeyi-Müəzzəməni ziyarət və təvaf məqsədilə get! Bu məqsədlə getsən, Məkkənin həqiqətini görərsən!».*

Həzrət Mövlananın hekayədə həcci misal göstərməsi onun çox zərif bir ibadət olması ilə bağlıdır. Buna görə də, həcc səfərinə ruhi bir hazırlıqla çıxmaq lazımdır.

Bu duyğulardan qafil olaraq edilən həcc və ümrələr onlardan gözlənilən nəticə və faydanı verməz. Bu baxımdan həcc və ümrələr qəlb həssaslığı ilə yerinə yetirilməlidir. Çünki bu ibadət ağappaq ehramlar içərisində mələklərin lətafətindən pay almaq cəhdidir. Buna görə də, ehramlı olarkən bir ov ovlanmamalı, ovçuya ov göstərilməməli, bir ot, hətta, bilərəkdən bir qıl da qoparılmamalıdır.

Ehrama girənlər müəyyən bir vaxt ərzində bir sıra halal olan şeylərin belə qadağan edilməsi vasitəsi ilə şübhəli və haram olanlardan uzaq durmağın nə qədər zəruri olduğunu dərk edərlər. Orada Yaradandan ötrü yaradılanlara şəfqətin, mərhəmətin, nəzakətin və xüsusilə, könül qırmamağın zəruriliyi-ni anlayarlar.

İstər həcc, istərsə də ümrədə ən mühüm iş az vaxtı ən dəyərli olan vəzifələrə sərf edə bilməkdir. Buna görə də, gərəksiz şeylərlə maraqlanmaq, yəni başqalarının bizimlə əlaqədar olmayan işləri ilə məşğul olaraq vaxtımızı boş sözlərlə lüzumsuz yerə sərf etməkdən qətiyyətlə çəkinməliyik. Çünki həcc və ümrədəki halımız qəlbimizin həssaslığını, mənəvi duyğularımızın dərinliyini göstərir.

Möminlərin qəlbində din qardaşlarına münasibətdə özünü onlardan üstün tutmaq, onları kiçiltmək və nifrət etmək kimi hisslər olmamalıdır. Çünki bu məkanda kimin kim olduğu bilinməz. Qəlblərin dərəcəsi insanlar üçün məchul, Allah üçün məlumdur.

Həzrət Xalidi-Bağdadinin təsəvvüf yoluna daxil olmamışdan əvvəl başına gələn bu hadisə çox mənalıdır:

Həzrət Xalid Bağdadi həcc üçün yola çıxıb Mədineyi-Münəvvərəyə çatanda orada nur üzlü bir şəxslə rastlaşdı. Yəmənli olan bu Haqq dostunun mənəvi cazibəsinə düşərək cahil bir şəxsin alim bir insandan nəsihət istəməsi kimi, ondan öyüd istədi. O şəxs də belə dedi:

*«-Ey Xalid! Məkkəyə çatanda əgər Kəbədə ədəbə uyğun olmayan bir şey görsən tez bunu edən şəxs haqqında pis bir şey fikirləşib, yanlış bir hökm vermə!*

*Gözünü və qəlbini belə şeyləri araşdırmaq-dan uzaq tut! Mənəvi dünyanı bəzəməklə məşğul ol!».*

İlk baxışda üstüörtülü bir xəbərdarlıq kimi görünən bu ifadə, əslində, həzrət Xalid Bağdadi ilə onu əsl mərtəbəsinə yüksəldəcək olan kamil Pir arasındakı qeyri-adi bir hala işarədir.

Ancaq həzrət Xalid Bağdadi Məkkeyi-Mükərrəməyə gedəndə oradakı mənəvi iqlimin həyəcanı ilə sanki bir könül sərxoşluğu içinə düşmüş və o şəxsin nəsihətini unutmuşdu. O bu halda olarkən bir cümə günü, səliqəsiz geyinmiş, qəribə görünüşü olan bir dərvişin kürəyini Kəbəyə çevirib ona baxdığını hiss etdi. Ürəyində belə düşündü:

*«Bu necə qafil bir adamdır ki, ədəb qaydalarına zidd olaraq kürəyini Kəbəyə çevirmişdir! Bu mübarək məqamın ucalığından xəbəri yoxdur!».*

Bu zaman onunla üz-üzə olan o şəxs Xalid Bağdadiyə:

*«Ey Xalid! Bilmirsən ki, möminə hörmət Kəbəyə hörmətdən daha fəzilətlidir. Çünki qəlb ilahi nəzərgahdır. Sağlam bir qəlb beytullahdır. Mədinədəki o saleh şəxsin nəsihətini könlündə qoruyub saxla!..»*,- dedi.

Bu sözlərdən həyəcanlanan həzrət Mövlana Xalid bu şəxsin adi bir insan deyil, böyük bir vəli olduğunu anlayaraq tez onun əllərindən tutdu və əfv istədi:

*«Ey saleh insan! Nə olar, mənə yazığın gəlsin, məni öz yoluna qəbul et!»*,-deyə xahiş etdi. O, qeyri-adi dərviş üfüqlərin sirli dərinliklərinə baxaraq:

*«Sənin tərbiyən mənə aid deyil! Sən Hindistanın Dehli (Cahanabad) şəhərində olan həzrət Abdullah Pir Dəhləvinin tərbiyəsi ilə kamala çatacaqsan! Allah uğurlu etsin!..»*,-dedi və oradan qeyb oldu.

Burada qissədən hissə prinsipi ilə mərhum atam Musa Əfəndinin də -kuddisə sirruh- bu nəsihətlərini dilə gətirmək istəyirəm:

*«Gedənlərə nəsihətim budur ki, orada səmimiyyəti, özünü bütün gücü ilə ziyarətə həsr etməyi yaddan çıxarmayın. Öz mənəvi dünyanızla məşğul olun, boş işlərə vaxt ayırmayın. Oradakı mənəvi təcəllilərdən istifadə edin.*

*Təbii, həccə gedəndə insanın ruhaniyyəti özü də bilmədən inkişaf edir. Böyük xeyir işlərlə məşğul olanlar çox vaxt təkrar həcc edənlərdir. Həccin mənəvi təcəlliləri ilə səxavət, mərhəmət və şəfqət duyğusu güclənir. Belə kimsələrin könlü və əli açılır, imanın*

3. Allah Dostunun dünyasından, İstanbul, 1999, s. 112.

*ləzzəti və həyəcanı içində ən çox sevdiklərindən Allah üçün asanlıqla sevə-sevə infaq edirlər».*[3]

Mübarək ayədə:

**«Sevdiyiniz şeylərdən (haqq yolunda) sərf etmədikcə savaba çatmazsınız. Şübhəsiz, Allah** *(Onun yolunda)* **xərclədiyiniz hər bir şeyi biləndir»** *(Ali-İmran, 92)* buyurur. Bir sözlə, bütün məsələ:

5. İradəni Haqqın rizasına qurban etməkdir

Həcc ibadətində qurban kəsməyin əsl məqsədi həzrət İbrahim və həzrət İsmayılın – əleyhiməssəlam- təslimiyyətinin xatırlanıb, onlardakı ilahi hikmətdən nəsib alınması və Allaha ixlas və təqva ilə qulluq edilməsi məsələsindən könüllərin agah olmasıdır. Yəni orada maddi varlığından sıyrılan, özündə bir varlıq hiss etməyən, bir sözlə, iradəsini Haqqa təslim edən və ilahi eşq atəşi ilə tutuşmağa meyli olan bir dərviş ədasında olmaq zəruridir. Belə ki uca Allah buyurur:

**«Onların nə əti, nə də qanı, əlbəttə, Allaha çatmaz. Allaha çatacaq olan yalnız sizin təqvanızdır** *(səmimi qəlbdən etdiyiniz ibadətdir)*...» *(əl-Həcc, 37)*

Düşünməliyik ki, həzrət İbrahim-*əleyhissəlam*- oğlunu fəda etdi. Onun oğlu həzrət İsmayıl da -

4. Bax, ət-Tövbə, 111.





*əleyhissəlam*- canını verdi. Biz nəfsimizi və malımızı Allah yolunda nə qədər sərf edə bilirik? Mübarək ayədə buyurulan **«Canlarının və mallarının qarşılığında cənnəti satın alan möminlər»**[4] vəsfinə hansı ölçüdə layiq oluruq?

Bütün bu fədakarlıqlar üçün ömür boyu üzərimizə düşən bir vəzifə var:

6. Şeytanı və nəfsi daşlamaq

Öncə də bildirdiyimiz kimi, şeytan daşlamaq daha çox daxildəki şeytanı daşlamaqla başlayır. Bu, həzrət İbrahim, həzrət İsmayıl və Həcər anamızın verdiyi vəsvəsələrə görə şeytanı qovub daşlamalarının bir xatirəsidir.

Hər zaman özümüzü sorğu-suala çəkməliyik ki, içimizdəki vəsvəsələri, şübhələri və xətaları nə qədər daşlaya bilirik? İbrahim *-əleyhissəlam-*, Həcər anamız və İsmayılın *-əleyhissəlam-* şeytanı və nəfsi daşladıqları andakı ixlas və istiqamətlərdən nə qədər pay ala bilirik? Bu vəziyyət bizi nə qədər duyğu dərinliyinə sövq edir?

Həcc və ümrənin bütün mərhələlərində qulun çatması arzu edilən səviyyə və dərəcəsi budur:

7. Ardıcıl olaraq dua və zikr etmək

Uca Allah buyurur:

**«...Ərəfatdan qayıdarkən Məşərül-Həramda**

**Allahı xatırlayın. Sizi doğru yola yönəltdiyi üçün Onu yada salın** *(Ona dua edin)*, **çünki siz bundan əvvəl** *(doğru yolu)* **azanlardan idiniz!»** *(əl-Bəqərə, 198)*

**«Həcc mərasimini tamamlayıb qurtardıqda ata-babalarınızı** *(keçmişdə, cahiliyyə dövründə fəxarətlə)* **yada saldığınız kimi, ondan da artıq Allahı yad edin! İnsanların bəzisi: «Ey Rəbbimiz, bizə nə verəcəksənsə, elə bu dünyada ver!»,- deyirlər. Belə şəxslərin axirətdə heç bir payı yoxdur».** (əl-Bəqərə, 200)

Belə ki həcc və ümrədə tez-tez *«Ləbbeyk, Allahümmə ləbbeyk»* deyilməsi də hər zaman zikr və dua halında olmağı təlqin edir.

Rəsulullah *-səllallahu əleyhi və səlləm-* belə buyurmuşdur:

**«Təlbiyə edən** *(«Ləbbeyk, Allahümmə ləbbeyk» deyən)* **elə bir müsəlman yoxdur ki, onun sağında və solunda olan daş, ağac, sərt torpaq onunla birlikdə təlbiyyə etməsin. Onların sizinlə bərabər təlbiyyə etməsi** *(sağ və solunu göstərərək)* **bu və bu istiqamətdə yer kürəsinin son hüdudunadək davam edər».** *(Tirmizi, «Həcc», 14/828)*

Zikr və dua halının qəlbdə tam yerləşməsi üçün təlbiyyə o qədər önəmlidir ki, fərdi ibadətlər, ümumiyyətlə, səssiz olduğu halda təlbiyyəni yüksək səslə söyləmək əmr edilmişdir. Beləliklə, qul həm özünü, həm də ətrafını qəlb və bədən ahəngi içində zikrlə, dua ilə məşğul edəcək.

Həzrət Peyğəmbər belə buyurmuşdur:

**«Cəbrail -əleyhissəlam- mənim yanıma gəlib əshabıma və mənimlə birgə olanlara təlbiyyə söyləyərkən səslərini yüksəltmələrini onlara deməyimi əmr etdi».** *(Əbu Davud, «Mənasiq», 26/1814)*

Peyğəmbərimiz *-səllallahu əleyhi və səlləm-* mübarək məkanlarda dua və zikr halının qorunması üçün danışıqların belə, hansı keyfiyyətdə olmasının zəruriliyini bu şəkildə bəyan etmişdir:

**«Beytullah ətrafında təvaf etmək namaz kimidir. Ancaq burada danışa bilərsiniz. Kim təvaf edərkən danışarsa, sadəcə xeyirli söz danışsın».** *(Tirmizi, «Həcc», 112)*

İndiyədək sadaladığımız düsturları bu məqsədlə açıqladıq:

8. Könlün ilahi əfv, feyz və mükafatı dadması

Mübarək hədisdə buyurulur:

**«Bir ümrə, başqa ümrəyədək ikisinin arasında baş verənlər üçün kəfarətdir. Qəbul olunan, xeyirli həccin əvəzi cənnətdən başqa bir şey ola bilməz!».** *(Buxari, «Ümrə»,1)*

Hərameyni-Şərifeynə gedən hər möminin arzusu həcc və ümrə ibadətini belə kamil mənada yerinə yetirərək anasından doğulduğu kimi günahsız olaraq evinə qayıtmaq müjdəsini haqq etmək və bu ilahi lütfə layiq olmaqdır.

Rəsulullah *-səllallahu əleyhi və səlləm-* belə buyurur:

**«Hər kim bu Kəbeyi-Müəzzəməyə həcc niyyəti ilə gəlib, pis söz danışmadan və hər cür pis davranışdan çəkinərək həccini yerinə yetirərsə, anasından doğulduğu kimi günahsız bir şəkildə tərtəmiz evinə dönər».** *(Müslüm, «Həcc», 438)*

Bu mücdələr, şübhəsiz, qəbul olunan, xeyirli bir həcc ziyarəti edən, yəni həcci başdan sonadək gözəllik və fəzilətlə dolu olan möminlər üçündür.

Mübarək hədislərdə buyrulduğu kimi, qəbul olunan xeyirli bir həcc nəticəsində «qul haqları»ndan başqa bütün günahlar bağışlanılır. Əfvin sahibi uca Allahdır. Ancaq qul haqlarının hesabı yenə də qiyamətdə soruşulacaq.

Bununla birlikdə, həcdəki ümumi əfv müjdəsinin mahiyyətini də doğru anlamaq zəruridir. Çünki bir insanın qılmadığı namaz, tutmadığı oruc və vermədiyi zəkatların bu əfvə daxil olub-olmadığı məsələsi ilə bağlı qəti bir məlumatımız yoxdur. Mömin ömrü vəfa etdiyi müddətdə bu borcları ödəməyə çalışmalıdır. Çünki yerinə yetirilməyən ibadətlərə görə qulun iki cür məsuliyyəti var:

1. Yerinə yetirməməkdən doğan məsuliy-yət

2. Qəza etsə belə, zamanında yerinə yetirməməkdən doğan məsuliyyət

Uca Allah qəbul olunan bir həcc nəticəsində namaz, oruc və zəkatları qəzaya saxlamanın günahını əfv edərsə də, qəzası yerinə yetirilməyən o borcların məsuliyyəti yenə də üzərimizdən götürülməz. Buna görə də, qəzaların mütləq yerinə yetirilməsi, zəkatın isə inflyasiya nəticəsində yaranan fərqi də nəzərə alaraq o zamankı bazar qiyməti ilə ödənməsi zəruridir. Bunları qəzaya saxlamağa görə də, uca Allahdan əfv diləmək zəruridir.

Elə buna görə də, həccə gedənlərə olan borclarını ödəmələri, üzərində haqqı olanlardan halallıq almaları, qəzaya qalmış namaz, oruc və zəkatları varsa, dərhal yerinə yetirmələrinin zəruri olduğu deyilir.

İbadət borclarını ödəməyə çalışıb, ancaq ömrü vəfa etmədiyi üçün bunu ödəyə bilməyənləri, inşallah, Rəbbimiz əfv edər. Ancaq öncə də ifadə etdiyimiz kimi, bu məsələ ilə bağlı qəti bir fikir olmadığına görə, tutmadığımız orucu, qılmadığımız namazları, vermədiyimiz zəkatları imkan ölçüsündə yerinə yetirməyə çalışıb, qısa bir müddətdə bu borclardan qurtarmağa səy göstərməliyik. Həcdəki ümumi əfvə arxayın olaraq ibadət borcları və qul haqları məsələsində səhlənkarlıq və laqeydlik göstərməməli, onların yerinə yetirilməsi üçün bütün güc sərf edilməlidir. Əskik qalanlar olarsa, onlar

5. Baxın, Buxari, «Qədər», 1.

üçün də Allahın əfv və mərhəməti istənilməlidir.

Qəbul olunan bir həccin əlaməti şəxsin həcdən sonrakı halının da ilahi riza istiqamətində olmasıdır. Mömin həcdə günahlarının əfv edildiyinə arxayın olaraq laqeydlik göstərməməli, bu aləmin bir imtahan diyarı olduğunu yaddan çıxarmamalıdır. Çünki bir mübarək hədisdə bəyan edildiyinə görə, elə insan var ki, cənnətə bir addım qalanda, Allah qorusun, cəhənnəmlik olur.[5] İnsanlıq tarixi iman məsələsində bu ayaq büdrəmələrinin acı təzahürü ilə doludur.

Bu baxımdan mömin qorxu və ümid arasında olan bir qəlblə yaşayıb, **«Sənə yəqin** *(ölüm)* **gələnədək Rəbbinə ibadət et!»** *(əl-Hicr, 99)* ilahi əmrini özünə həyat düsturu etməlidir.



Zəruri olduğu kimi yerinə yetirilən bir həcc, yəni qəbul olunan xeyirli həcc ilahi əfv müjdəsi ilə birgə qula məsuliyyət, əfv etmək, qəlbi və bədəni hər zaman təmiz saxlamaq, İslam qardaşlığı, üstünlüyün ancaq təqva ilə olması düşüncəsi, halal qazanc həssaslığı, təvəkkül, təslimiyyət və ixlas kimi mənəvi xislət və gözəlliklər də qazandırır. Həccin bu dünya və axirət qazancları bununla da qurtarmır.

Həccin mömin qullara verdiyi ən önəmli fayda uca Allahın rizasıdır. Bundan başqa dünyanın dörd





bir yanından gələn müsəlmanlar arasında sevgi və səmimiyyət yaranır. Gerçəkdən də, həcc ziyarəti Allahın sonsuz rəhmətinin təcəlli etdiyi əfv və bağışlanmağa nail olmuş müsəlmanların dərin bir iman həyəcanı ilə qaynaşdığı mübarək, ehtişamlı bir iqlimdə baş verir. Orada müxtəlif ölkələrdən dilləri və rəngləri fərqli olan, yaşayış, adət və ənənələri bir-birindən seçilən çoxsaylı insanlar Kəbənin ətrafında möhtəşəm bir birlik tablosu nümayiş etdirirlər. Bu müqəddəs məkandakı mənəvi sevgi və duyğular bütün bu fani və dəyərsiz varlıqlardan üstün olur, müsəlmanları eyni duyğularla döyünən tək bir ürəyə çevirir. Könül bərabərliyinin rahatlıq və sevinci içində gözəl bir din qardaşlığı yaranır.

Başqa sözlə, həcc İslamın sadəcə dini bir şərti olaraq qalmır, bu uca dinin əxlaqi, ictimai və siyasi yönünü də gücləndirən bir mahiyyət qazanır. Möminlərin cahanşümül həyatlarının yüksək bir abidəsi kimi qarşımıza çıxır.



# MƏDİNEYİ-MÜNƏVVƏRƏ ZİYARƏTİ

Həcc və ümrə ibadətlərinin başlanğıcında, ya da sonunda Mədineyi-Münəvvərədə ziyarət etdiyimiz Rəsulullahın *-səllallahu əleyhi və səlləm-* məqamı qəlbin ilahi məhəbbət naxışları ilə bəzənib ülvilik qazandığı bir məkandır. Buna görə də, Rəsulullahın -səllallahu əleyhi və səlləm- uca xatirələri və can bəxş edən nəfəsi ilə dolu olan bu mübarək torpaqlara üz sürtərkən Onun ruhaniyyətindən pay almaq eşqi ilə Rövzeyi-Mutahhara ziyarət edilməli və bu mübarək məkanın sinəsində kainatın ən qiymətli cövhərinin olduğu heç bir zaman unudulmamalıdır. Ona ümmət olmağın həyəcanı içində tamamilə başqa bir ədəb və təzim göstərilməlidir.

Çünki Rəsulullah *-səllallahu əleyhi və səlləm-* belə buyurmuşdur:

**«...İbrahimin –əleyhissəlam- Məkkeyi-Mükər-rəməni həram** *(bölgəsi)* **etməsi və onun üçün dua oxuması kimi, mən də Mədineyi-Münəvvərəni həram (müqəddəs) bölgəsi etdim...»**

*(Buxari, «Fəzailül-Mədinə», 6; Müslüm, «Həcc», 462)*





Rövzeyi-Mutahharanın qönçəsi sevimli Peyğəmbərimizi *-səllallahu əleyhi və səlləm-* canımızdan, mallarımızdan, övladlarımızdan, bir sözlə, hər şeydən daha çox sevməliyik. Çünki uca Allahın «həbibim» xitabına və iltifatına yalnız o nail olmuş və bu sevgi ümmətə də əmr edilmişdir. Belə ki Qazı İyaz-rəhmətullahi əleyh-Tövbə surəsindəki:

**«***(Ey Rəsulum!)* **De: «Əgər atalarınız, oğullarınız, qardaşlarınız, övrətləriniz, qəbiləniz** *(qohumlarınız)***, qazandığınız mallar, kasad olmasından qorxduğunuz ticarət, xoşunuza gələn məskənlər sizə Allahdan, Onun peyğəmbərindən və Allah yolunda cihaddan daha əzizdirsə, Allahın əmri** *(əzabı)* **gəlincəyədək gözləyin. Allah fasiqləri doğru yola yönəltməz!»** *(ət-Tövbə, 24)* mübarək ayədən yola çıxaraq:

*«Allah ümmətə öz sevgisi ilə birlikdə, Rəsulullahı -səllallahu əleyhi və səlləm- sevməyi də fərz etmişdir»,-* deyir.

Bir varlığa duyulan sevgi və məhəbbət bu məhəbbətə yol açan, ya da onunla əlaqəsi olan şeylərə də sirayət və inikas edər. Məsələn, Uhudu yüz minlərlə dağdan ayıraraq sevimli edən Rəsulullahın *-səllallahu əleyhi və səlləm-* ona olan xüsusi məhəbbətidir. Buna görə də, Mədineyi-Münəvvərəyə çatanda Uhuda sevgi dolu baxışlarla doyunca baxmaq zəruridir. Çünki Peyğəmbərimiz-

əleyhissəlatü vəssəlam-: **«Uhud bizi sevər, biz də Uhudu sevərik»** *(Buxari, «Cihad», 71)* buyurmuşdur.

Mədineyi-Münəvvərə hicrətdən öncə **«Yəsrib»** adlı adi bir şəhər olduğu halda, onu **«Mədineyi-Münəvvərə»**yə çevirib, bütün ümmətə sevdirən bu şəhərin Peyğəmbərimizin həyatındakı yeri və Onunla bağlı olan zəngin xatirələrdir. Gerçəkdən, **«Mədineyi-Münəvvərə»**nin möminlərin könlündə heç bir şəhərlə müqayisə edilməyəcək dərəcədə çox sevgisinin olmasının səbəbi bu şəhərin adının çəkildiyi zaman həzrət Peyğəmbəri xatırlatması ilə bağlıdır.

Bunun kimi, Allahı sevmək də Peyğəmbərimizi sevməyi və Ona tabe olmağı zəruri edir. Buna görə də, uca Allah belə buyurur:

«*(Ey Rəsulum!)* **De: «Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın…»** *(Ali-İmran, 31)*

Eyni şəkildə Allah Rəsuluna tabe olmaq üçün çalışmaq, Onun sevgisinin həyəcanını duya bilmək də insana Allahın sevdiyi qullardan biri olmaq şərəfini verər. Belə ki seçilmiş əshab Rəsulullahın -*səllallahu əleyhi və səlləm*- həqiqətinə yaxınlaşa bilmək üçün Onun ruhaniyyəti ətrafında bir pərvanə olub, Onda fani olmağı dünyanın ən böyük neməti saymış və bu yolla da ilahi lütflər qazanmışdır. Buna görə





də, xəstə və qafil qəlblərimizin ən təsirli dərmanı Rəsulullaha olan məhəbbət və O yüksək xarakterə heyranlıq nəticəsində meydana gələn «sünnəyə tabe olma»dır.

Bu baxımdan heç bir şey Rəsulullahın *-səllallahu əleyhi və səlləm-* sevgisinin önünə keçməməlidir. Nə yaşadığımız ev, nə ailəmiz, nə övladlarımız, nə də işimiş, ticarətimiz!..

Çünki Rəsulullah *-səllallahu əleyhi və səlləm-* öz övladına aşiq olmuş bir ananın uşağına olan sevgisindən daha böyük bir məhəbbətlə biz ümmətinə qol-qanad gərmiş, ömrü boyu da **«ümməti, ümməti…»**,-deyərək yaşamışdır.

Peyğəmbərimiz *-əleyhissəlatü vəssəlam-* əshabına buyururdu:

**«Diqqətli olun! Mən həyatımda sizin üçün bir təhlükəsizlik vasitəsiyəm. Vəfat edəndə də qəbrimdə: «Ey Rəbb, ümməti, ümməti!..»,-deyə ilk Sur üfürülənədək çağıracağam!..»** *(Əli əl-Müttəqi, «Kənzül-Ummal», c. 14, s. 414)*

Həzrət Peyğəmbər *-səllallahu əleyhi və səlləm-* Uca Dostunun yanına **«Ümməti, ümməti..»**,-deyərək köç etdi.

Son nəfəsində **«Mən sizi Kövsər hovuzumun başında gözləyəcəm…»** deyərək bizlərə olan

6. Baxın, Qazı İyaz, «Şifai-Şərif», Beyrut, 1404, c. II, s. 596.

məhəbbət, şəfqət və bağlılığını ifadə etdi.

Bir sözlə, uca Allahın:

*«(Ey ümmətim!)* **Sizə özünüzdən bir Peyğəmbər gəldi ki, sizin əziyyətə** *(məşəqqətə)* **düşməyiniz ona ağır gəlir, o, sizdən** *(sizin iman gətirməyinizdən)* **ötrü təşnədir, möminlərə şəfqətli, mərhəmətlidir!»** *(ət-Tövbə, 128)* buyuruğuna uyğun olaraq həyatı boyu Peyğəmbərimizin *-səllallahu əleyhi və səlləm-* ağlaması, gülməsi, üzülməsi, sevinməsi, dua və yalvarışı hər zaman biz ümməti üçün oldu. Hətta, Merac kimi özəl bir anda belə, bizləri düşündü, bizlər üçün çırpındı…

O, elə bir rəhmət ümmanıdır ki, onun hörmətinə zülm, şirk və üsyan dönəmlərində belə, Məkkəyə göylərdən bəla yağmadı, bir müsibət enmədi. İlahi intiqam təcəlli etmədi. Çünki onların arasında həzrət Peyğəmbər *-səllallahu əleyhi və səlləm-* var idi. Bu gerçəyi uca Allah belə ifadə edir:

*«(Ey Rəsulum!)* **Sən onların arasında ola-ola Allah** *(Sənə hörmət əlaməti olaraq)* **onlara əzab verən deyil!..»** *(əl-Ənfal, 33)*

Ancaq Peyğəmbərimiz *-səllallahu əleyhi və səlləm-* Məkkədən Mədinəyə hicrət edəndə vəziyyət dəyişdi. Müşriklərə səmavi bəlalar enməyə başladı. Böyük bir bərəkətsizlik və qıtlıq yarandı. Onlar səmaya baxsalar, gözləri qaralır, aclıqdan başları dönürdü.

Bu o deməkdir ki, kimin könlündə həzrət Peyğəmbər sevgisi özünə yer etmişsə, Allah o könülə əzab etməyəcək. Müşriklərə belə, Onun hörmətinə mərhəmət edən Allah Onu sevən, Onun sevgisini ömrü boyu qəlbində daşıyan və Onun sunnəsindən ayrılmayan şəxsi heç atəşdə yandırarmı? Ancaq kimin könlündə də o Hidayət Günəşi yoxdursa, o, əzabdan qurtulmayacaq.

Haqqın hüzurunda və ömrü boyu bizi dilindən düşürməyən və könlündən çıxarmayan Peyğəmbərlər Sultanına -*səllallahu əleyhi və səlləm*- eyni eşq və məhəbbətlə qarşılıq vermək, ona ümmət olmaq şərəfinə nail olan sevdalı qəlbin birinci vəzifəsidir.

Ancaq bu, O, könlümdədir deməklə, ya da elə fərz etməklə əldə ediləcək bir keyfiyyət deyil. «Sevən sevdiyini yamsılayar və onu zikr edər» hökmünə uyğun olaraq Peyğəmbər aşiqlərinin əlaməti hər hal və hərəkətində Ona bənzəməyə çalışmalarıdır. Bir də Ona çoxlu səlat və salam söyləmələridir…

Peyğəmbərlər Sultanı -*səllallahu əleyhi və səlləm*- aləmlərin şanı uca bir başçısı olduğundan həzrət İmam Malikə görə, O Varlıq Nurunun mübarək qəbrinin olduğu yer Kəbədən də müqəddəsdir. Çünki bütün kainat onun xatirinə yaradılmış və ona ithaf edilmişdir.

Mübarək hədisdə Peyğəmbərimiz *-səllallahu əleyhi və səlləm-* belə buyurmuşdur:

**«Məni vəfatımdan sonra ziyarət edən kimsə, sanki məni yaşayarkən ziyarət etmişdir!»** *(Darekutni, «Sünən», II, 278)*

Ancaq bu ziyarət zamanı ədəbə riayət etmək çox önəmlidir. Çünki həqiqi faydalanmanın ilk şərti ədəbdir.

Belə ki bir gün həzrət İmam Malik mehrabda olarkən o dövrün xəlifəsi Əbu Cəfər Mənsur məscidə gəlir. O, bir sıra suallar verir. Onların arasında elmi bir müzakirə başlayır. Ancaq Əbu Cəfər Mənsur söhbətə başı qarışaraq səsini yüksəldir. Bu zaman həzrət İmam Malik:

*«-Ey xəlifə! Burada səsinin tonunu azalt! Çünki Allahın xəbərdarlığı səndən daha fəzilətli insanların üzərinə endi…*,-deyə onu xəbərdar etdi.

Xəlifə şahid olduğu bu yüksək ədəbə görə:

*- Ey İmam! Dua edərkən qibləyə doğru, yoxsa Rəsulullaha doğru üz tutum?*,-deyə soruşdu.

Həzrət İmam Malik belə buyurdu:

*- Üzünü niyə Ondan çevirəcəksən ki?! O, sənin və cəddin həzrət Adəmin qiyamətədək Allaha vəsiləsidir. Əksinə, sən Peyğəmbərə doğru yönəl və onun şəfaətini istə ki, uca Allah da Onu sənə şəfaətçi etsin!..»*[6].





Bəziləri bu həqiqəti görmək istəmir və hacıların Rövzəyə doğru yönəlməsinə razı olmurlar. «*Salam ver, keç, qibləyə dön!*»,-deyirlər. Ancaq Rəsulullah -*səllallahu əleyhi və səlləm*- diridir. Çünki şəhidlərin ölməyib yaşadıqları bir həqiqətdirsə, onlardan üstün olan peyğəmbərlərin və xüsusilə, həzrət Məhəmmədin də müstəsna bir dirilik içində olduğu şübhəsizdir.

Abidə əs-Səlmani **«tabein»** (Peyğəmbərin səhabələrini görən şəxslər) nəslinin ən önəmli İslam hüquqçusu və hədis bilicilərindən biri idi. Peyğəmbərin vəfatından iki il öncə müsəlman oldu, ancaq Onu görmək bəxtiyarlığına nail olmadı. Abidənin bu sözü ilk müsəlmanların Peyğəmbərimizə olan sevgisini çox gözəl anladır:

*«Yanımda Rəsulullahın saçının bir telinin olması mənim üçün dünyanın bütün sərvətindən daha dəyərlidir».* *(Əhməd, III, 256)*

Məşhur İslam alimi Zəhəbi də, Abidə əs-Səlamninin Peyğəmbər sevgisini dilə gətirən yuxarıdakı sözlərini oxuyarkən duyğularını belə ifadə etmişdir:

«Rəsulullahın saçının bir telini insanların sahib olduğu bütün qızıl və gümüşdən üstün tutan Abidənin bu sözləri uca bir məhəbbətin göstəricisidir. O böyük alim həzrət Peyğəmbərin vəfatından yalnız əlli il keçəndən sonra belə söyləyirsə, Onun bu

dünyadan köçməsindən yeddi yüz il sonra biz Onun saçının bir telini, ya başmağının bağını, ya da su içdiyi torpaqdan olan qabın bir parçasını əldə edə bilsək, görəsən, nə söyləməliyik?

Əgər varlı bir adam sərvətinin böyük bir hissəsini belə bir şeyi əldə etmək üçün sərf etsə, sən ona sərvətini israf edən, ya da ağılsız olaraq pul xərcləyən bir şəxs kimi baxarsan?

Xeyr, xeyr! Rəsulullahın mübarək əlləri ilə tikdiyi Məscidi-Nəbəvini ziyarət edə bilmək, Onun əziz şəhərində səadət hücrəsinin yanında ona salam verə bilmək üçün bütün sərvətini xərcləməkdən çəkinmə!

Mədinəyə çatanda Onun sevimli Uhud dağına doyunca bax və onu sən də sev! Çünki Uhud dağını həzrət Peyğəmbər *-əleyhissəlatü vəssəlam-* çox sevərdi. Onun Rövzəsinə və gəzib-dolaşdığı yerlərə dəfələrlə gedərək ruhunu doyunca qidalandırmağa çalış! Çünki Peyğəmbərimiz olan O şəxsi canından, balandan, sahib olduğun hər şeydən, bir sözlə, bütün insanlardan daha çox sevmədikcə kamil bir mömin ola bilməzsən…» *(Zəhəbi, «Siyəru Aləmin-Nübəla», IV, 42-43)*

İslam tarixinin səhabə və tabein dövründən sonra ən ehtişamlı səhifəsini təşkil edən əcdadımız Osmanlı, padşahından çobanınadək bütün xalqının misilsiz bir Peyğəmbər sevgisi ilə yaşadığı bir toplum idi.

Peyğəmbərə *-əleyhissəlatü vəssəlam-* hər adı çəkiləndə səlat və salam söyləməklə birlikdə, ehtiramla əlini qəlbinin üzərinə qoymaq, onun mövlid-şərifi oxunarkən doğulduğu anı ifadə edən misraları birlikdə, ayaqüstə dinləmək kimi çoxsaylı hörmət və məhəbbət təzahürlərinin ən mükəmməl örnəklərini bu uca dövlətin zirvəsində dayanan padşahlar bir adətə çevirərək yaşatmışlar. Mədineyi-Münəvvərənin poçtu gəldiyi zaman dəstəmazını təzələmədən, oradan gələn kağızları öpüb gözünə sürtmədən və ayağa qalxmadan oxutduran tək bir Osmanlı padşahı yoxdur.

Bundan başqa, Məscidi-Nəbəvinin təmiri zamanı hər daşı böyük və kiçik dəstəmazlı olaraq və bəsmələ oxuyaraq yerinə qoyan osmanlıların bu təmir müddətində çəkiclərinə keçə bağlayıb, Peyğəmbər ruhaniyyətini narahat etməkdən çəkinmələri misli görünməmiş bir ədəb və hörmət nümunəsidir.

Osmanlılar dövründə Mədineyi-Münəvvərəyə xüsusi hazırlıq görərək gələn **«sürrə alayı»** şəhərə girməmişdən öncə yaxın bir yerdə dayanar, özünü Mədineyi-Münəvvərənin mənəvi iqliminə hazırlayıb istixarə edəndən sonra mənəvi işarə ilə Rəsulullahın hüzuruna yaxınlaşıb, Onu ziyarət edərdilər. Onlar geri qayıdanda da şəfa və təbərrük olaraq Mədineyi-Münəvvərənin mübarək torpağını öz ölkələrinə gətirirdilər.

Osmanlı padşahlarının o zamanın portretləri demək olan minyatürlərində sarıqlarının ucundakı düyünün bir süpürgə maketi olduğunu görəsən kim bilir? Onlar bununla Hərameyniş-Şərifeynin süpürgəçisi olduqlarını bildirmək istəyirdilər və Hərameynin süpürgəçilərinin maaşlarını şəxsən öz sərvətlərindən verirdilər.

Həzrət Peyğəmbərdən *-səllallahu əleyhi və səlləm-* misilsiz bir xatirə olaraq Onun saç və saqqalının mübarək tellərinin məscid minbərlərində qırx boxça içində saxlanılıb, «saqqali-şərif» adı ilə əsrlərdən bəri ümmətə bir bərəkət və rəhmət olması çox böyük bir məhəbbət və ehtiram nümunəsidir.

Osmanlının o mübarək məkanlara olan hörməti və ədəbi paytaxtdan başlayırdı. Belə ki o zamanlar həcc səfərində Avropa qitəsinin Asiyaya keçidinin ilk məntəqəsinə **«Həram»** adı verilmiş və Hərameyniş-Şərifeynin mənəviyyat və ədəbinə orada bürünərək yola çıxılmışdır. O yolda insanların qəflətini göstərən heç bir hərəkətə yol verilməmişdir.

Bu məsələ ilə bağlı şair Nəbinin 1678-ci ildə dövlət adamları ilə birlikdə getdiyi həcc səfərindəki xatirəsi çox ibrətlidir:

7. Baxın, İbn-Ərəbi, «əl-Fütuhatül-Məkkiyə», araşdırma: Osman Yəhya, Qahirə, 1986, X, 133-138.

Nəbi bu səfər zamanı bir paşanın qafillik edərək ayağını Mədineyi-Münəvvərəyə doğru uzatdığını görür. O, bu vəziyyətdən çox narahat olur və məşhur nətini yazmağa başlayır.

Sübh namazına yaxın karvan Mədineyi-Münəvvərəyə yaxınlaşarkən Nəbi yazdığı nətin Məscidi-Nəbinin minarələrindən oxunduğunu eşidir:

**Sakın tərki-ədəbdən kuyi-məhbubi-Xudadır bu,**
**Nəzərgahi-ilahidir, məqami-Mustafadır bu!...**

«Uca Allahın nəzərgahı və Onun sevimli Peyğəmbəri həzrət Məhəmməd Mustafanın - *səllallahu əleyhi və səlləm*- məqamı və şəhəri olan bu yerdə ədəbsizlik etməkdən çəkin!..»

**Müraəti-ədəb şərti ilə gir, Nəbi, bu dərgaha,**
**Mətafi-qüdsiyandır, busegahi-ənbiyadır bu!...**

«Ey Nəbi! Bu dərgaha ədəb qaydalarına əməl edərək gir! Bura mələklərin ətrafında pərvanə olduğu və peyğəmbərlərin öpdüyü mübarək bir məqamdır!»

Bu vəziyyətdən çox həyəcanlanan Nəbi tez müəzzini tapır:

«-Bu nəti kimdən və necə öyrəndiniz?,-deyə soruşur.

Müəzzin:

- Bu gecə Allah Rəsulu *-səllallahu əleyhi və səlləm-* yuxumuzda bizə: **«Ümmətimdən Nəbi adlı bir şair məni ziyarət etməyə gəlir. Bu şəxsin qəlbi mənə eşq və sevgi ilə doludur. Bu sevgisinə görə, onu Mədinə minarələrindən öz nəti ilə qarşılayın!»,**-buyurdu. Biz də bu Peyğəmbər əmrini yerinə yetirdik…

Nəbi hıçqıra-hıçqıra ağlamağa başlayır. O həm ağlayır, həm də belə deyir:

- Deməli, Allah Rəsulu *-səllallahu əleyhi və səlləm-* mənə «ümmətim» dedi. Deməli, İki Cahan Günəşi məni ümmət olmağa qəbul etdi!..»

Deməli, həcc və ümrə ibadətində ən önəmli məsələ bu gözəl duyğularla o torpaqlara gedərək həzrət Peyğəmbəri *-səllallahu əleyhi və səlləm-* ziyarət və Beytullahı təvaf etməkdir.



Bir sözlə, bütün ibadətlər kimi həcc və ümrə ibadətinin də ilahi yanında qəbul olunacaq bir səviyyədə yerinə yetirilməsi kamil bir iman və irfan üfüqünə bağlıdır. Həcc və ümrəni *«qəbul edilən, xeyirli həcc»* kimi yerinə yetirmək də günahlardan təmizlənməyə və Haqqın rizasına yola açır. Yəni bu ibadətlərdən gözlənilən nəticə onları ancaq uca





Allahın razı olduğu səviyyədə yerinə yetirməklə əldə olunur.

Bu məsələ ilə bağlı həzrət Şiblinin həcc etmiş bir şəxsə ziyarətin mənəvi yönünə işarə edərək söylədiyi bu sözlər bütün həcc yolçuları üçün çox ibrətli bir xəbərdarlıq və təlimdir:

«Həccə niyyət edəndə bu günədək olan günahlarına görə tövbə edib sirati-müstəqimə yönəlmədinsə, əslində, niyyət etmiş sayılmırsan.

Ehram üçün paltarını çıxararkən bütün günahlarını çıxarıb atmadınsa, əslində, paltarını çıxarmış olmursan.

Həcc üçün qüsl edərkən bu təmizlik səndəki mənəvi kirləri və xəstəlikləri də təmizləmədisə, əslində, təmizlənmiş sayılmırsan.

Hərami-Şərifə girərkən bütün haramlardan və Haqdan uzaqlaşdıran hər cür söz və davranışdan imtina etməyə söz vermədinsə, əslində, hərama girmiş olmursan…

Qurban kəsərkən ifrat nəfsani istəklərini və iradəni Haqqın rizasında yox etmədinsə, əslində, qurban kəsmiş olmursan.

Şeytana daş atarkən içindəki cəhaləti və vəsvəsələri də daşlamamışsansa, səndə elm və irfan hasil olmamışsa, əslində, daş atmış sayılmırsan.

Kəbəni ziyarət etdiyinə görə səndə ilahi bərəkətlər artdımı, könlün rahatlıq və sevinclə doldumu? Çünki mübarək hədisdə:

**«Hacılar və ümrə ziyarəti edənlər Allahın ziyarətçiləridirlər. Ziyarət edilənin onu ziyarət edənə bərəkət verməsi onun üzərindəki bir haqdır»,-buyurulur. Sən bu bərəkətin fərqinə varmadınsa, əslində, ziyarət etmiş sayılmırsan…»**[7]

Bir sözlə, həzrət Şiblinin diqqəti yönəltmək istədiyi məsələ ilahi buyruğun yerinə yetirilməsidir:

**«Həcci və ümrəni Allah üçün tam yerinə yetirin!...»** *(əl-Bəqərə, 196)*

Bütün gözəllikləri ilə icra edilən həccdən hacıların öz ölkələrinə aparacaqları ən önəmli hədiyyələr o mübarək məkanın gözəllikləri və başlanğıcdan bu yana o gözəllikləri yaşayaraq özlərindən sonra ibrətli, hikmətli xatirələr qoyub gedən saleh qulların öygüyə layiq əxlaqı olmalıdır.

Bu baxımdan Pakistanın mənəvi memarı olan Məhəmməd İqbal bir gün Mədinədən qayıdan hacıları ziyarət edərək onlara kamil bir möminin könül üfüqünü göstərən bu sualları verir:

*«Mədineyi-Münəvvərəni ziyarət etdiniz! Uxrəvi Mədinə bazarından könlünüzü hansı hədiyyələrlə*

*doldurdunuz? Gətirdiyiniz maddi hədiyyələr, namaz papaqları, təsbehlər, səccadələr bir müddət sonra köhnələcək, solacaq və sıradan çıxacaq. Mədinənin heç solmayan, könüllərə həyat verən, ruhani hədiyyələrini gətirdinizmi?..*

*Hədiyyələrinizin içində həzrət Əbu Bəkrin sədaqət və təslimiyyəti, həzrət Ömərin ədaləti, həzrət Osmanın həyası və səxavəti, həzrət Əlinin irfanı və cihadı varmı? Bu gün min bir iztirab içində qıvrılan İslam dünyasına könlünüzdən bir səadət əsri həyəcanı verə biləcəksinizmi?»*

**Uca Allah hamımıza Hərameyni-Şərifeynin ruhaniyyətindən layiqincə feyz almağı nəsib etsin! Həssas və duyğulu bir könüllə həm ruhən, həm də bədənlə həcc və ümrə ziyarəti gerçəkləşdirə bilməyi ehsan etsin! Bu ruhda etdiyimiz, ya da edəcəyimiz ibadətlərimizi də qəbul və xeyirli etsin!..**

**Amin!..**

